**Əli Umud oğlu Əliyev**

# Azərbaycanın ulu keçmişi

**(Dərs vəsaiti)**

**ADPU-nun Tədris Metodika Şurasının 02 iyun 2017-ci il tarixli iclasının qərarına əsasən dərs vəsaiti kimi çap edilir (pr № 2)**

**Bakı - 2017**

# Mündəricat

# Giriş.

Ölkəmiz müstəqillik qazandıqdan sonra xalqımızın öz kökünə, soyuna artan marağı bu mövzuda çoxlu elmi araşdırmalara səbəb olmuşdur. Odur ki, Azərbaycanın ulu keçmişi olan əski türklərin, şumərləriin, Qafqaz albanlarının tarixinin, mədəniyyətinin dərindən öyrənilməsi, Azərbaycan xalqının etnogenetik prosesinin təşəkkülü, formalaşması, zaman etibarilə bu prosesin böyük bir tarixi dövrü-------- eradan əvvəl I minilliyin əvvəllərindən bizim eranın VIII—XII əsrlərinə qədərki dövrü əhatə etməsi kimi ümdə məsələlərin müqayisəli şəkildə araşdırılması xalqımızın etnogenezi baxımından aktual bir mövzudur.

Bu mövzunun aktuallığının ikinci tərəfində son dövrün olayları dayanır. Çünki yaxın onillikdə baş verənlər, erməni uydurmaları tarixi reallığın ortaya qoyulmasını, müxtəlif istiqamətli araşdırmaların aparılmasını zəruri edir. İctimai, siyasi, etnoqrafik, tarixi, ədəbi materialların, faktların aşkarlanmasına indi yeni səpkidə yanaşma daha vacib və daha zəruridir. Odur ki,Qafqaz Albaniyasının hərtərəfli öyrənilməsi bir sıra qaranlıq və gizli qalan amillərin aşkarlanması deməkdir. Buna görə də 2016-cı ildə Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun "Qafqaz Albaniyasının intibahı" layihəsi həyata keçirilir.

Dərs vəsaitinin predmeti Azərbaycan xalqının etnogenetik formalaşmasında birbaşa təsiri olan türk tayfalarının spesifikasını, ayrı-ayrı türksoylu nəsillərin izlərini əks etdirən toponimlərin, dil faktlarının müqayisəli müstəvidə araşdırılmasını şərtləndirir. Bu məqsədlə Azərbaycanın ulu keçmişi, Qafqaz Albaniyasının izləri və sözlərini dərindən araşdırmaq və öyrənmək üçün Qafqaz Albaniyasının sərhədlərini dəqiqləşdirmək, albanların Azərbaycan türkünün etnik soyunu şərtləndirən amilləri ortaya qoymaq, regionlar üzrə (Laçın, Kəlbəcər, Şəmkir, Tovuz, Bərdə, Gəncə, Qəbələ, Qax, Şəki, Oğuz, Zakatala, Balakən, Ağcabədi, Ağdam, Beyləqan və s.) Qafqaz Albaniyasının izlərini özündə əks etdirən toponimlərin leksik anlamını aydınlaşdırmaq, dil faktlarını Şumer, Alban, Azərbaycan türk dillərinin paralelliyi əsasında şərh etməklə xalqımızın milli etnik soyunun kumliyini və bu soyun yayılma arealını, məskunlaşdığı ərazilərin həmin soya məxsus olmasını bir daha aşkarlamaqdır.

Dərs vəsaitinin yazılma səbəbi bu sahədə olan boşluğu doldurmaq və Azərbaycanın vərəsəliyə malik olduğunu bir daha diqqətə çatdırmaq ideyasıdır. Bu sahədə ikinci bir səbəb isə Qiyasəddin Qeybullayevin "Azərbaycan türklərinin təşəkkülü tarixindən" kitabının mənə stimul verdiyi aşağıdakı qiymətli reallıq və doğru həqiqətlərdir:

“Ali məktəblərdə türk xalqlarının tarixi kursunun tədrisində qondarma, dolaşıq konsepsiyalar əvəzinə problem məhz bu aspektə qoyulmalıdır. Tələbələr bilməlidirlər ki, türk xalqlarının tarixi bəşər tarixinin, Azərbaycan xalqının tarixi isə ümumtürk tarixinin ən qədim və ən zəngin hissəsidir; çünki qədim türklərin ilk dövlət qurumları məhz Azərbaycan ərazisində yaranmışdır. Türk etnoslarının qədim dövrdə və erkən orta əsrlərdə Azərbaycan ərazisində Manna və Maday (e.ə. VIII—VI əsrlər), Sak çarlığı (e.ə. VII—V əsrlər), Atropatena (e.ə. IV—eranın III əsrləri), Albaniya (e.ə. IV—eranın VII əsrləri), Cənub-Şərqi Avropada Skif çarlığı (e.ə. VII—III əsrlər), Sarmat çarlığı (e.ə. III—eranın III əsrləri), Hun xaqanlığı (III—V əsrlər), Avar, Bolqar və Xəzər xaqanları (VI—IX əsrlər), Mərkəzi Asiyada və Orta Asiyada Hun xaqanlığı (e.ə. III—I əsrlər), Kuşan çarlığı (I—IV əsrlər), Aqhun (Eftalit) çarlığı (IV—VI əsrlər), Türk xaqanları (VI—VIII əsrlər) və b. çoxlu dövlət qurumları vardır. Sonrakı əsrlərdə türk dövlət qurumları daha çoxdur.

Mannalar, madaylar, atropatenlilər və albanlar haqqında irihəcmli kitablar çap olunmuşdur. Lakin bu kitabların heç biri xalqımızın mənşəyi məsələsində azərbaycanlıda milli iftixar hissi, milli qürur hissi, ümumiyyətlə, xoş emosiya yaratmır, çünki göstərilən etnosların etnik və dilcə mənsubiyyətləri haqqında həmin kitablarda deyilənlər xalqın ruhuna tamamilə ziddir. Azərbaycanlıları öz köklərindən ayırdıqlarına, onların etnogenezini tamamilə yad məcraya saldıqlarına və beləliklə, xalqımızın etnik tarixini cılızlaşdırdıqlarına görə bəzi tarixçilərimizin günahlarını əvvəl-axır xalq üzlərinə çırpacaqdır. Beləlıəri bulaq üstündəki quru ağaclara bənzəyirlər. Belə ağacların kölgəsi olmaz.”(18,239-240).

Vəsaitin elmi yeniliyi araşdırma predmetinin yeni dövrə uyğun inkişaf etdirilməsi aspektlərinin müəyyənləşdirilməsi və faktların aşkarlanmasına yeni səpkidə yanaşmadır.

Dərs vəsaitindən tarix və filologiya fakültəsinin tələbələri və bütün Azərbaycansevər vətənpərvərlər yararlana bilərlər.

Tədqiqat giriş, iki fəsil, nəticə və istifadə olunmuş ədəbiyyat siyahısından ibarətdir.

## I fəsil

# Qafqaz Albaniyası haqqında ümumi xronika.

Qafqaz Albaniyası dedikdə Azərbaycanın Araz çayından şimaldakı torpaqlarının, o cümlədən tarixən Azərbaycanın tərkib hissəsi olmuş Dağıstan, Ermənistan, Gürcüstanın Tiflis və Qara dəniz sahilləri də daxil olmaqla, geniş ərazilərinin tarixi nəzərdə tutulur. Albaniya çoxsaylı etnosların (tayfaların) yaşadığı ərazidir. Bu etnoslar içərisində aparıcı mövqeyə malik olan Alban etnosu haqqında e. ə. 331-ci ildə II əsr müəllifi Arrian ilk məlumat vermişdir. Qiyasəddin Qeybullayev bununla əlaqədar yazmışdır: "İran ordusu ilə Makedoniyalı İsgəndərin ordusu arasında baş vermiş Qavqamel döyüşü ilə əlaqədar yazısında Arrian qeyd edir ki, İran ordusunda albanlar da vardı. Başqa mənbədə isə Alban çarının İsgəndərə iki it göndərməsi qeyd olunur. Bu məlumat göstərir ki, artıq e. ə. IV əsrdə alban etnosu və onun dövlət qurumu vardı... Albaniya indi Dağıstana mənsub Samur – Dərbəndarası bölgə, indi Ermənistana aid Göycə və Zəngəzur bölgələri daxil olmaqla indiki Şimali Azərbaycan ərazisini əhatə edir. Lakin Azərbaycanın Kür çayının Arazla birləşdiyi yerdən Xəzərəqədərki hissəsindən cənubdakı inzibati rayonların (Saatlı, Sabirabad, Neftçala, Salyan, Biləsuvar, Cəlilabad, Masallı, Lənkəran, Lerik və Astara rayonları) ərazisi və Naxçıvan qədimdə Midiya e. ə. IV əsrdən eranın VII əsrinə qədər Atropatenaya məxsus idi. Albaniya dövləti təxminən min il ömür sürmüş və ərəb işğalı nəticəsində VIII əsrdə süqut etmişdir." (18,171.)

Yuxarıda qeyd etdik ki, Albaniya çoxsaylı etnosların yaşadığı ərazi olmuşdur. Bu etnoslar içərisində ən böyük və aparıcı tayfa albanlar olmuşdur. Ona görə də ərazi, dövlət qurumu alban tayfasının adı ilə Albaniya adlandırılmışdır. Albaniyada çoxluq təşkil edən albanlarla yanaşı aran, abant, qarqar, qat, quqar, kaspi, kəmər, ipin, maskut, sliv, ciqb, çul , gel, lek, sak, uti, şarvan, şamak, şirak, dondar, kanqar, tərtər, sovde, hun, savar, macar, bolqar, her, amazonka tayfalarının da yaşadığı haqqında məlumat vardır. Həmçinin bunlardan alban, aran, abant, qarqar, kaspi, kəmər, sak, uti, maskut, satak, çul, şarvan, şamak, kanqar, dondar, tərtər, sovde, hun, savar, macar, bolqar və şirak tayfalarının türk mənşəli olduğu sübuta yetirilmişdir. Buradan bir daha aydın olur ki, 30 tayfanın 22-si türk tayfası olmuşdur. Bu etnoslar Albaniyanın aborigen nəsilləridir. Bu gün Alban dövlətinin ərazisi həmin aborigen etnosların dillərini yaşadan toponimlər vasitəsilə müəyyənləşməkdədir. Biz – Azərbaycan türkləri qədim türk tayfalarının birliyindən formalaşıb şumer, alban, Azərbaycan türkü adlansaq da, milli varlıq xəzinəsi olan dilimizi qoruyub saxlamış, ən yüksək səviyyədə bu günümüz və gələcək nəsillər üçün ərməğan

etmişik. Dilimizdən qiymətli heç nəyimiz yoxdur. Dilimiz bizim varlıq güzgümüzdür. Bu güzgüdə e. ə. mövcud olmuş etnosların adlarının toponimlər vasitəsi ilə müasir dövrümüzdə yaşantıları ona dəlalət edir ki, həmin etnoslar bu yerlərin aborigen nəsilləridir. Demək, toponimlər tarixi həqiqətləri yaşadan daş yaddaşdır. Odur ki, qədim etnosların müasir dövrümüzlə səsləşən yaşantılarına, izlərinə nəzər salaq.

**Alban.** Türkmənşəli və türkdilli tayfa olmuşdur. Hal-hazırda Qazaxıstanda alban adlı türkdilli qəbilə yaşayır. Qədim dövrdə Albaniya ölkəsində "Alban" adlı şəhər və çay var idi. (Böyük Pilini, Klavdi Ptolomey). Dərbənd ətrafında Alpan adlı şəhər ("Tarixi-Dərbəndnamə"), Dağıstanın Aqul bölgəsində Alpan kəndinin xarabalıqları, Qusar bölgəsinin dağlıq ərazisində Alpan adlı xarabalıqları, Quba bölgəsində Alpana və Yardımlı bölgəsində Alban kəndləri, Gürcüstanda Alban və iki Alpani kəndləri indi də durur.

Türkmənistanda Alban adlı iki toponim vardır. Murov dağında qədim Aqvan (Alban) müdafiə istehkamları, Alban çayı (Laçın, Qubadlı bölgələri ərazisində), Qarabağda Malıbəyli kəndi yaxınlığında Qarqar çayının sağ qolu Aqvanın (Albanın) sahilində Avan (Alban) xarabalıqları, Qax bölgəsinin Ləkit kəndi ərazisində "Alban qapısı", Qəbələdə "Alvan dərə", Gürcüstanın Batumi vilayətində Türkiyə ilə həmsərhəd zonasında "Əlvan qala" xarabalıqları və nəhayət, Şəki şəhərində qədim bir məhəllənin adı Aqvanlar (Albanlar) adlandırılmışdır." (3,34). Sadalanan toponimlərin varlığı bu ərazilərdə yaşayan alban etnosunun aborigen olmasını təsdiqləyir. Azərbaycanın ulu keçmişi olan Qafqaz Albaniyasının izlərini bu gün dilimizdə işlətdiyimiz onomastik vahidlərdə tam aydınlıqla görürük. Bu onomastik vahidlər milli dil tariximizin ən qiymətli xəzinəsidir. Bu məxəz bizim üçün doğma və əzizdir. Çünki Qafqaz Albaniyasına aid onomastik vahidlərin məna anlamı müasir Azərbaycan dilinin məna anlamı ilə eynidir. Albaniyanın dövlət dili qıpçaq mənşəli qarqar dili olmuşdur. Bunu Qarqar-qıpçaq türkçəsi də adlandırmaq olar. Qafqaz Albanlarının dili Dədə Qorqud dilidir, müasir Azərbaycan türk dilidir. Odur ki, bütün Qafqaz Albaniyasından yadigar qalmış onomastik vahidlər müasir dövrümüzlə səsləşir, məna anlamı qədim və müasir türk dillərinin məna anlamı ilə eyniyyət təşkil edir. Qafqaz Albaniyası dövründən bizə gəlib çatan sözlər və izlər yüzlərcədir. Bunlardan ən dəyərlisi və ağı qaradan ayırd etmək üçün yararlı olanı 2010-cu ildə çap olunmuş "Qafqaz Albanlarının dili və ədəbiyyatı" kitabıdır. Kitabın müəllifi Bəxtiyar Tuncay bu kitabın ərsəyə gəlməsində t. e. d., millət vəkili Fəzail Ağamalının kömək və qayğısından bəhrələnmişdir. Bu kitab – Qıpçaqdilli Alban ədəbiyyatı, Oğuzdilli Alban ədəbiyyatı deməkdir. Həmçinin bu kitab Azərbaycan ədəbi-nəzəri fikrində yeni bir başlanğıcın əsasını qoymuşdur. Artıq erməni məkrləri tam aydınlıqla şərh eidlərək, yalan, şayə olduğu sübuta yetirilmişdir: "Əldə olan əlyazmalar həm alban dili məsələsinə, həm də alban əlifbası ilə bağlı suallara tam və

birmənalı cavab verməkdədir. Yeri gəlmişkən qeyd edək ki, erməni və alban əlifbaları eyni mənşəli olsalar da, yazılış, xətt və üslubuna görə bir-birindən fərqlənirlər. Yəni hərflər eyni olsa da, xətlər fərqlidir. Ermənilər "bolorqir" və "notrqir" adlandırdıqları bu iki xətti erməni yazısının iki fərqli xətti kimi təqdim edirlər. Gerçək isə budur ki, "bolorqir" ermənilərə, "notrqir" isə albanlara məxsusdur. Yəni əldə olan bütün alban mətnləri məhz, "notrqir"lə yazılmışdır. Albanlar hətta erməni dilində yazanda da öz xətlərindən (əlifbalarından) istifadə etmişlər. Odur ki, "notrqir"lə yazılmış bütün mətnlərin, o cümlədən ermənidilli mətnlərin müəlliflərinin məhz albanlar olduğunu tərəddüd etmədən söyləmək olar. Albanlar heç vaxt "bolorqir"dən istifadə etməmişlər. "Bolorqir"lə yazılmış mətnlərin müəllifi, şübhəsiz ki, ermənilərdir. əlbəttə, bəzi hallarda, ola bilsin ki, kiçik istisnalar olmuşdur, fəqət bu bir o qədər də böyük önəm daşımır." (9,39).

Bu gün Qafqaz Albaniyasının əlyazmalarının izləri deyil, özləri dünyanın müxtəlif ölkələrində (Avstriya, Ukrayna, Ermənistan və i.) "erməni qıpçaqcası" adı altında qorunan albandilli ədəbi nümunələri dil açıb söyləyirlər ki, biz alban əlyazmaları "notrqir" xətti ilə yazılmış, qarqar-qıpçaq dilində olan və təmiz türk sözləri ilə ifadə olunan mətnlərik, həmçinin Qafqaz albanlarına məxsusuq. Qarqar-qıpçaq dili Alban dilidir. Əgər "erməni-qıpçaqcası" varsa, onda belə şıxır ki, ermənilər də türkdürlər. Çünki qıpçaqlar türkdürlər.

Ermənilər "erməni-qıpçaqçası" ifadəsi ilə sübut edirlər ki, onlar Alban əlifbasını, dilini özününküləşdirib, albanların ər/er tayfasının adı altında gizlənib ərmən/ermən torpaqlarına sahib durub, Ərməniyyəni Ermənistan etmişlər. Ərməniyyə ər/er alban tayfasının məskunlaşdığı türk diyarıdır, İrəvan xanlığıdır.

Professor İlhami cəfərsoy "İber və h"ay folklorunda türk mifik təfəkkürünün izləri" adlı kitabında dərin elmi araşdırmadan sonra tədqiqatın nəticəsi kimi bu qənaətə gəlmişdir ki, Misir heroqliflərini Aran kahinləri yaratmışdır. Misirin ilk dövlətçiliyini də Kuş nəslindən çıxan kahinlər yaratmışlar. Troyanı Assuriyanın himayəsi altında Elamın Şuşa cəngavərləri qorumuşlar. Ellada xalqını Troyanın işğalından qabaq Olimpi tutan Aran nəsli yaratmışdır. Alimpe xalis tatar sözüdür. Makedoniyalı İskəndər Ana xəttilə Aran nəslindəndir, H"Erakl Alban nəslindən çıxmışdır.(25,194).

**Qarqarlar.** Qafqaz Albaniyasının albanlardan sonra Azərbaycan ərazilərində geniş yayılmış qədim etnoslarından biri də qarqarlardır. Qarqarlar haqqında e. ə. I minilliyin başlanğıcında yazılmış Homerin "İliada" əsərində qeyd olunur ki, İda dağının zirvələrindən biri Qarqar adlanır və Dardanel boğazından azca aralıda Qarqar şəhəri yerləşir. Həmçinin Homer "İliada" əsərində cəngavər atlı qadınlar (döşsüzlər), türk qızları haqqında məlumat

vermişdir. Hətta orada qeyd olunmuşdur ki, amazonkalar ox atmağa mane olmamaq üçün sağ döşlərini kəsirmişlər.

"Azərbaycanın Qarqar Uruqları və Amazonlar" kitabının müəllifi Aydın Qarabağlı Qarqarlar haqqında geniş tədqiqat aparmış və aşkar etmişdir ki, Azərbaycan ərazisində ilk dövlət qurmuş Kuti soyundan olan qarqarlar etnik mənsubiyyətə görə prototürklərin nəsil davamçılarıdır. Həmçinin onu da qeyd etmişdir ki, Qarqar boyunun bir qövmü m.ö. II minillikdə Liviyanın quzeyindən axan Qront çayı yaxalarında məskunlaşmış və yaşadıqları məkanı Karkar adlandırmışdır. III Salmanasarın m. ö. 851-ci ildəki hərbi yürüşü "Qarqar döyüşü" adı ilə tarixə düşmüşdür.

Qarqarlar minilliklər boyu tarixi Azərbaaycanın müxtəlif regionlarında yaşamış, yaxından qonşuluq etdikləri, qohumluq əlaqələri yaratdıqları amazonlarla m. ö. 66-cı ildə Albaniya uğrunda Roma legionerlərinə qarşı "Qarqar düzündə" çiyin-çiyinə vuruşmuş, hətta ondan daha qədim zaman kəsiyində (13-cü yüzillikdə) Turova (Troya) müharibəsində birlikdə iştirak etmişlər.

M. ö. XXII-XXI yüzilliklərə aid qaynaqlarda isə III Ur sülaləsinin çarları işğal etdikləri yaşayış məskənlərinin, qalaların sırasında Karkarın da adı çəkilir. Şərqşünas İqor Dyakanov da apardığı tarixi elmi tədqiqatlardan bu qənaətə gəlir ki, qarqarlar Güney Azərbaycanın torpaqlarında ilk dövlət (tayfalar ittifaqı) qurub yaratmış Kuti boylarından biridir.(4,26). Qarqar adını yaşadan və bu gün dilimizdə işlənən onomastik vahidlər Qarabağ ərazisində daha çoxdur. Xocalı ərazisində Qarqar dağları cərgəsi, Xocavənddə Qarqar kəndi, Mil düzündə Qarqar düzü adlı yer olmuşdur, nəhayət, Qarqar çayı dünyada məşhurdur. Cahid Kazımov "Albaniyanın digər türk tayfaları" məqaləsində qeyd etmişdir ki, Qarqarların türk mənşəli tayfa olduğunu sübut edən ən mühüm dəlillərdən biri yalnız Azərbaycanda, İranda, Şimali Qafqazda deyil, bütün Mərkəzi Asiyada bu tayfanın son dərəcə geniş iz qoymasıdır. Hələ vaxtilə Dionisi Perieget (II əsr) qarqarların Orta Asiyada da yaşadıqlarını qeyd etmişdir. Orta Asiyada Qarqarxan vilayəti, Qarqar çayı, Karkar toponimi, Qazaxıstnda Qarqarlı dağ massivi, Türkmənistanda iki Qarqar çayı, Buxara əmirliyində Qarqar çayı, Qazaxıstanda Qarqar rayonu və Qarqar sovetliyi, qıpçaqlarda qədimdən Karkar antroponimi və s. onomastik vahidlərin olması Qarqarların çox geniş ərazilərdə yayılması ilə bərabər, həm də bu ərazilərin türk əraziləri olması bir daha təsdiqlənir. Albaniyanın dövlət dili, ədəbiyyat dili qıpçaq mənşəli qarqar dili olmuşdur. Bu dilə Qarqar-qıpçaq türkcəsi də deyilir.

Qarqarların ornitonim mənşəyi haqqında ilk dəfə məlumat verən İlhami Cəfərsoy olmuşdur. Qarqar köçəri quş adıdır.

**Bolqarlar.** Qədim türk tayfası olan bolqarların izləri, adları yaşadıqları ərazilərdə öz əksini tapmışdır. “Kitabi-Dədə Qorqud” dastanında Bolqar sözü şəxs adı kimi işlənmişdir. Biləsuvar rayonu ərazisisndə Bolqar kəndi, Bolqar Göytəpə yaşayış məntəqəsi, Bolqarçay çayı adları bolqar tayfalarının bu ərazilərin sakinləri olduqlarına dəlalət edir. Laçın rayonunun Ərikli kəndində Bulğar şəxs adı kimi qeydə alınmışdır.

“Erkən orta əsrlərə aid mənbələrdə bulqarların kazan, çakar, kol (kul), kuvyar və basil adlı tayfalardan ibarət olması göstərilir. Ermənistanda Qazan adlı qala XII əsrdən məlumdur və orada... keçən əsrdə Qazançı Adlı azərbaycanlı kəndləri vardı.

Bulqarların çakar tayfasının adı Ermənistanda Çaxırlı azərbaycanlı kəndinin adında öz əksini tapmışdır. Çaxırlı adlı kəndlər Azərbaycanda da vardır.” (19,104.)

**Dondarlar.** Qədim türk tayfasıdır. E. ə. VI-V əsr mənbələrində Qafqazda yaşamaları barədə məlumatlar vardır. Tovuz və Qubadlı rayonlarında Dondarlı, Tovuzda Dondar-Quşçu, Dəvəçi rayonunda Qala-Dondar qala xarabalığı, Qazax rayonunda Dondardağ və s. toponimlər dondarların bu yerlərin yerli sakinləri olduğunu sübut edir. “Kitabi-Dədə Qorqud” dastanında Dəli Dondar şəxs adı kimi işlənmişdir. Türkmənistan, Özbəkistan, Qazaxıstan və Türkiyədə də Dondar etnosu ilə bağlı toponimlər geniş yayılmışdır.

**Peçeneqlər.** “Peçeneq” sözünün türk dillərində baca və ad düzəldən – aq şəkilçisindən (qıpçaq, şamaq, kaymaq, qazax, gəncək, bərdək və s.) ibarət olduğu elmi ədəbiyyatda qeyd olunur. Mənası “ərin bacısı” deməkdir. Laçın rayonunda Piçənis kəndinin camaatı arasında bir söz işlənirdi; filankəslər “bacılı” tayfasındandır. Demək, həmin tayfa “ərin bacısı” anlamını verən peçeneqlərdəndir. Piçənis sözünün mənası da peçeneq tayfasının adından formalaşmışdır. Peçeneqlər qıpçaq soyunun bir qoludur. Peçeneq /padsaanak/ paçanaq adları ilə qeydə alınmış bu etnos dilimizdə olan “bacanaq” sözünü də yaratmışdır ki, “bacıların ərləri” mənasını verir. Yuxarıda qeyd etdiyimiz kimi türk dilində paçanaq / peçeneq baca “ərin bacısı” və ad düzəldən – aq şəkilçisindən ibarətdir.

Peçeneqlər hun tayfalarından biridir. Səkkiz qola ayrılır: çur, kapan, çopan, erdim, kil, kuloba, kuyər, karabay (Qarabağ). Mənbələrdə qeyd olunur ki, Çur etnonimi Oğuz ərazisindəki Corlu (Çorludan), Yardımlıdakı Çoryurt, Laçın və Kəlbəcərdəki Çorman toponimlərində, Tovuzdakı Çuratan kənd adında öz izini qoymuşdur.

Kuyərçi etnonimi quqar türk tayfa adı və - çı şəkilçisindən ibarət olub Göyərçin Veysəlli (Cəbrayıl), Göyərçindağı toponimlərində özünü yaşadır.

Erdim etnonimi Yardımlı rayonunun adında (yardım/ erdim) özünü qoruyub saxlamışdır. Kapan etnonimi Tərtər rayonu ərazisində 4 Kapan oykonimi, Ermənistanda Kafan şəhəri adlarında qalmışdır. Karabay etnonimi XIII əsrdən adı çəkilən Qarabağ toponimlərində özünü yaşadır.

**Qıpçaqlar.** Qıpçaq sözünün mənası sarışın deməkdir. Çünki bizanslılar və latınlar qıpçaqlara kumanos, ruslar isə poloves demişlər. Kumanos və poloves sarışın mənasını verir. Iran mənbələrində qıpçaq/qıfçaq kimi səslənir və mənası əsəbi, qəzəbli deməkdir. Qıpçak tayfaları Azərbaycan, qazax, qırğız, qaraqalpaq, özbək, türkmən, tatar, başqırd, balkar, qumux və s. xalqların etnogenezində öz izlərini qoymuşlar. Qıpçaq etnonimi toponimlərdə bu gün də yaşayır. Qax rayonunda Qıpçaq kəndi, Kəlbəcərdə Qıpçaq aşırımı qıpçaqların bu ərazilərdə yaşadığını təsdiqləyir.

**Kəngərlər.** Peçeneqlərin bir qolu da Kəngərlərdir və peçeneqlərlə eyni kökdəndir. Ermənistanda Kəngər dağları vardır. Qarabağda üç Kəngərli kəndi vardır. “Kəngərlər orta əsrlərdə Kanqar adlanırdı. Bizans imperatoru Konstantin yazır ki. Peçeneqlərin üç tayfası xəngər adlı bitkini yediklərinə görə, Xəngər adlandırılır.

Şahlar Həsənoğlu “Ala buludlar” kitabında yazır ki, kəngər Dəli dağda bitən və özəyi yeyilən bitkidir. Aşıq Ələsgərin bir şerindən görünür ki, aşıqlar deyişməzdən öncə kəngəri yeyib, üstündən ayran içərmişlər.

Neçə aşıq qaçırmışam meydandan,

İstəyirsən bir-bir keçirim sandan.

Gəmirib kəngərdən, içib ayrandan,

Coşub gərgədandan, fildən danışma.

....M.İ.Artamonov yazır ki, kanqarlar haqqında antik tarixçilərin əsərlərində bilgilər var. V.V.Bartold bildirir ki, Plini və Ptolomey Albaniyada Kanqar şəhəri haqqında məlumat verirlər. Deməli, kəngərlilər Azərbyacanda ən azı eranın əvvəllərindən yaşamışlar.

Faruk Şumərə görə, Kanqar peçeneqlərin üç əsas boyunun – Ertim, Çur və Yulanın müştərək adı olmuşdur.” (24,311-312)

**Siraklar.** Türkdilli bu tayfa sirak/şirak/çirak kimi adlarla özünü əks etdirmişdir. Sirak haqqında ilk məlumat verən Strabondur. O, I əsrdə Sirakena adlı məkanın Azərbaycanda olduğunu qeyd etmişdir. Demək, siraklar hələ e. ə. Azərbaycanda yaşamışlar. Ermənistanda Şirak rayonu, Şirak əyaləti, Şirakqala xarabalığı, Çirak adında iki kənd vardır. Çıraqlı

Ağdam, Daşkəsən, Laçın rayonlarında kənd və Dağıstanda, Cənubi Azərbaycanda Çıraxlı kəndləri vardır.

**Kerqillər.** Türk tayfalrından biri də Kerqillər olmuşdur. Elmi ədəbiyytda kerq (kərki) il isə el – Kərki eli mənasında izah olunmuşdur. Naxçıvanda Kərki, Qazaxda Kərkibaşlı kənd adlarında əks olunmuşdur. Türkmən və özbəklərdə də kərki tayfaları olmuşdur. Albaniyada indiki Ağdərə rayonu ərazisində Xark qalası olmuşdur. Həmin qala da kerq/xarq tayfasının adı əsasında formalaşmışdır. Kərkicahan kəndi Xocalı rayonuna aid idi. Kərki tayfaları Türkiyə, Özbəkistan ərazilərində də qeydə alınmışdır.

**Savarlar.** Bizans tarixçisi Periskos V əsrdə sabarlardan məlumat vermişdir. Savarlar hunların bir qoludur. Savar/suvar/sabir/sibir/savir adları ilə tarixi mənbələrdə qeyd olunmuşdur. Savarlar haqqında ilk məlumatı II yüzillikdə Klavdi Ptolomey vermişdir.

Savar tayfa adı məncə, sav-ər/suv-ər kimi başa düşülməlidir, mənası isə atlı ər deməkdir. Biləsuvvar – suvar/savar (suv-ər\sav-ər), Qaleysuvar və Suvarlı kənd adları (atlı tayfa, süvari atlı deməkdir) savar tayfa adından formalaşmışlar.

**Xəzərlər.** Türk tayfasıdır, hələ vaxtilə Ə.Dəmirçizadə “xaz”, “kas” sözləri ilə bir kökdən olduğunu yazmışdır. Odur ki, xəzərlər kassitlər, kaspilərlə eyni köklüdürlər. Deməк, Xəzərlər saklarla da eyni kökə malikdirlər. Azərbaycanda xəzərlərin izləri çoxdur. Lerikdə Xəzəryaylaq, Ordubadda Xəzəryurd, Füzulidə Xəzərdağ və Xəzər dənizi xəzər etnonimini yaşadan adlardır.

**Çollar (Çullar)**. Çolların türk tayfası və bir etnos kimi müxtəlif ərazilərin yerli sakinləri olmasını Azərbyacan toponimləri sübut etmişdir. Cəbrayılda, Ağdamda, şərur-Dərələyəz qəzasında, Zəngəzurda Çul və Çullu kəndləri Çul etnoniminin yaşantılarıdır.

Azərbaycanda Çollar xristianlığı ilk qəbul edən tayfa olmuşdur. Bu haqda Kalankatuklu Moisey “Alban tarixi” əsərində qeyd etmişdir ki, Dərbənd yaxınlığındakı Çol şəhərindəki I-II əsrlərədə Yelisey xristianlığın təlimi ilə məşğul idi. Demək, çol tayfası daha qədim dövrlərdə bu əraziyə gəlmişdir ki, onun adını daşıyan şəhər də formalaşmışdır.

**Katiklər və yaxud Kataklar** türk tayfasıdır. “Alban tarixi”əsərinin müəllifi Moisey Kalankatuklu Katuk tayfasından olmuşdur. Katuk tayfasıının adı Kalankatuk kənd adında əks olunmuş, hal-hazırda həmin kənd Bərdə rayonunda Kələntərli adlanır.

“Alban tarixi” əsərində qeyd olunur ki, Arsax vilayətlərindən biri kotayk adlanır. XVII əsrdə “Katak” toponimi Qarabağda “Qoduqlu” kimi yazılmışdır.

## Qafqaz albanları nəyə görə Azərbaycan türkünün etnik soyudur?!

Azərbaycan türkünün etnik tarixi e.ə. III və I minilliklərə dirsəklənir. Eradan əvvəlki minilliklərdə bu yerlərin sahibinin türkmənşəli etnosların olması konsepsiyasının müəllifi Qiyasəddin Qeybullayev sübut etmişdir ki, e.ə. burada yerli, avtoxton türkmənşəli etnoslar – Manna, Maday, Kas, Alban, Kaspi və b. yaşamışlar. "Albaniyanın türk tayfalarının kimmerlər və saklarla qaynayıb-qarışması nəticəsində alban xalqı yaranmışdır. Bu xalqın V-VII əsrlərdə yazısı və dili də türkcə idi. XI-XII əsrlərdə səlcuq oğuzları nə cənubda, nə də şimalda heç kimi türkləşdirməmişdir. Azərbaycan dili gətirilmə dil deyil, kökləri ilə qabaqkı minilliklərə gedən dildir. Səlcuq oğuzları Azərbaycanın hər iki hissəsində türklərin sayını artırmış və Azərbaycan dilində türk dillərinin oğuz qrupuna aid dillər üçün səciyyəvi xüsusiyyətləri çoxaltmışlar."(18, 40)

Albanlarda olan şəxs adları (Aran, Ərbak, Zaban, Parnak, Əmbak, Ərnək, Əncak, Bazuk, Kornak, Kozis, Zober, Urnayr, Asay, Sato, Manas, Aratan, Xurs, Mate, Urbat, Xosken, Qonaq, Kazan, Bağır, Bakur, Manuşik, Baxan, Davtaq, Abas, Satinik, Taquhi, Əsən Cəlal, Aq-Buqa, Tursun, Hamam, Alp-Kuş, Altuntaş, Tuk-Teqin, Başar və s.), türkmənşəli toponimlərin (Alazan, Kür, Keravn, Talqe, Tosaren, Balasakan, Artsak, Arkuqet, Balk, Qoş, Dasoran, Dut, Kava, Kost, Taşton, Urdu, Qaç, Alason, Qaq çölü. Tapat, Çula, Barmak, Sanar, Beyləqan, Çapar və s.) və türkmənşəli tayfaların (alban, abant, aran, qat, quqar, qarqar, kaspi, kəmər, lbin (lpin), maskut, sliv, ciqb, çul, gel, lek, sak, satak, uti, şarvan, şamak, şirak, her və s.) adlarının məna anlamı və yaşantıları birmənalı şəkildə sübut edir ki, Qafqaz Albanları Azərbaycan türkünün etnik soyudur. Yuxarıda sadalanan şəxs adları, türkmənşəli tayfaların adları Qiyasəddin Qeybullayevin "Azərbaycan türklərinin təşəkkülü tarixindən" kitabında şərh edilmişdir. Odur ki, onların məna anlamı, haqqında məlumat vermədim.

Azərbaycan dilinin təşəkkülü izahatlardan göründüyü kimi e.ə. I minilliyə — manna, maday, kas və alban dillərinə gedib çıxır. "Dilimizin birinci layının kökləri isə daha qədimlərə — eramızdan əvvəlki minilliklərdə Ön Asiya və Azərbaycan ərazisində yaşamış Şumer, Lulube, Kuti, Kas və b. etnoslarla bağlıdır." (18, 299). Onu da qeyd edək ki, leksik paralellər apardıqda görürük ki, ən qədim minilliklərdə dilimizin təşəkkülünün bünövrəsində qədim türk dili durur. Çünki Şumerlərin də soyunda qədim türk tayfalarının rolu danılmazdı. Şumer dili də, Alban dili də aqülyunativ (iltisaqi) dillər qrupuna daxildir və ahəng qanununa tabedir.

Azərbaycan dilinin təşəkkülü məsələsində yeni konsepsiya ilə çıxış edən Qiyasəddin Qeybullayev qeyd etmişdir ki, Azərbaycan türk dilinin başqa sələfi Atropatena və Alban ümumxalq danışıq dilləridir, "Mannada və Midiyada tayfa ittifaqları xalqa çevrilmədiyinə görə ümumxalq danışıq dili də yarana bilməzdi. Ona görə təxminən eyni tarixi mərhələ çərçivəsində yaranmış bu dillər Azərbaycan dilinin bünövrəsini təşkil edir. Alban tarixçisi Musa Kalankatlının çar Vaçaqanın (V əsr) bütün əyalətlərə fərmanlar göndərməsi haqqında məlumatından (I kitab, 20-ci fəsil) aydın olur ki, Albaniyada ümumxalq danışıq dili vardır. Alban dili həm də V-VIII əsrlərdə yazılı dil idi. Mənbələrdə qeyd olunur ki, "Bibliya" alban dilinə tərcümə olunmuşdu. Bu onu göstərir ki, alban dili "Bibliya" kimi kitabın dilini verməyə qadir lüğət fonduna malik dil idi. Bilirik ki, ərəblərin Azərbaycanı işğal etməsilə alban etnosu dini mənsubiyyətcə parçalanmış, VIII əsrin əvvəlində xilafətin köməyi ilə erməni kilsəsi alban kilsəsini özünə tabe etmişdir. Bu alban yazısının məhvinə səbəb olduğu kimi, ümumalban danışıq dilinə də zərbə vurmuşdu. Əslində ümumxalq Alban danışıq və yazılı dilinin tarixi bununla bitir və VIII əsrdən sonra Albaniya və Atropatenada türk tayfalarının, albanların müsəlman hissəsi və atropatenlilərlə konsolidasiyası yeni etnosun – Azərbaycan etnosunun formalaşmasına səbəb olmuşdur. Böyük Nizami və Xəqani məhz Albaniya ərazisində əsrlər boyu formalaşmış mədəni irsi və formalaşmış dili əhatə edən özül üzərində yüksəlmişdi. Nizami etnik mənsubiyyətcə türk idi və onun ana dili də albanların türk dili idi. Məlumdur ki, Nizami qıpçaq qızı ilə evlənmişdi. Yəqin ki, həmin qız nə ərəb, nə də farsca bilmirdi. Nizami türk deyildisə (XI-XII əsrlərə qədər Alban əhalisinin Qafqaz mənşəli olmasını söyləyən tarixçilərimizin ardınca getsək) türk qızı ilə necə ailə qura bilərdi?!...

Oğuzların XI-XII əsrlərdə gəlməsi ilə Azərbaycan xalqının və Azərbaycan dilinin formalaşması istiqamətində davam edən prosesin yeni mərhələsi başlanır." (18, 235.)

Qafqaz Albaniyası Azərbaycan türk dövləti olmuşdur. Azərbaycanın qədim və erkən orta əsrlərə dair çoxminlik etnik tarixi onun etnogenezi ilə bağlı e.ə. VIII əsrdən etibarən qədim türk, şumer, alban xətti ilə sıralanaraq müasir duruma gəlib çatmışdır. "Azərbaycan xalqının tarixi ümumtürk tarixinin ən qədim və ən zəngin hissəsidir; çünki qədim türklərin ilk dövlət qurumları məhz Azərbaycan ərazisində yaranmışdır. Türk etnoslarının qədim dövrdə və erkən orta əsrlərdə Azərbaycan ərazisində Manna və Maday(e.ə. VIII-VI əsrlər), Sak çarlığı(e.ə. VII-V əsrlər), Atropatena(e.ə. IV-eranın VII əsrləri).... və b. çoxlu dövlət qurumları vardır."(18,239.) Bu isə imkan verir deyək ki, Azərbaycanın mədəniyyəti, incəsənəti və dilinin kökləri e.ə. I minilliyə gedib çıxır. Demək, xalqımızın dili, mədəniyyəti və incəsənətinin tarixi vərəsəsi qədim türklər, şumer və albanlardır. Bu vərəsəlik aktını tarixi sənəd kimi təsdikləyən dil faktlarıdır. Dil böyük bir xəzinədir. Bu

xəzinənin dəyəri millətin varlığı ilə ölçülməlidir. Toponimlər isə dil xəzinəsinin açarı, dünyanın ünvanıdır. Bu ünvan tarixin daş yaddaşını bütün zamanlarda yaşadır, tarixi həqiqətləri saxtalıqlardan qoruyur. Əgər xalqımızın milli dili, Azərbaycan dili olmasaydı, ərəb, fars, rus, erməni və gürcülər bizi yer üzündən silib, özününküləşdirib yox etmişdir. Necə ki, Qafqaz Albaniyasını yox edib özününküləşdirdikləri kimi. Bu barədə Ziya Bünyadov yazmışdır: “Erməni katalikosluğu və nahararlarının mənafeyi hər dəfə tələb etdikdə erməni kilsəsi həmişə yadelli işğalçıların köməyinə əl atır, “Xaç bayrağı” ilə öz yolu üzərində tarixi Albaniya və onun bir hissəsi Qarabağ (Arsax) xalqlarını yox edirdi.” (29,227.) Bu gün isə həmin yoxetmənin davamı kimi fars, rus, erməni və gürcü müəyyən siyasi çalarlarla iyrənc niyyətlərindən əl çəkməmiş, məqam düşdükdə torpaqlarımızı, adət-ənənələrimizi, milli yeməklərimizi, musiqimizi, toponimlərimizi öz adlarına çıxaraq saxta tarix yaratmaqda həyasızcasına davam edirlər. Atalar gözəl demişdir: “Qətranı qaynatsan olarmı şəkər?! Cinsi naqis olan, cinsinə çəkər.”

Milli etnomənəviyyatımızın ən qiymətli dürlü incisi türk mənşəli toponimlərdir. Azərbaycanda yaşamış tayfaların etnik mənsubiyyətinin türk olması, Albaniyanın onomastik leksikasının dil mənsubiyyətinin qədim türk dilinə aid olması birmənalı şəkildə sübut edir ki, ulu əcdadlarımızın etnik kökü və dili yerli türkmənşəli tayfalardan qaynaqlanmışdır.

## Niyə albanlar müsəlmanlığı qəbul etdi,
## amma erməni, gürcü xristianlıqda qaldı?!

Təbiəti rəngarəng, iqlimi müxtəlif (9 iqlim tipi vardır) olan Azərbaycannın xalqı da insanlara yanaşmada, hər hansısa məsələyə münasibətdə mülayim və xoşxasiyyətdir. Bu baxımından etnik soyumuz olan Alban etnosu ona görə müsəlmanlığı qəbul etmişdir ki, onun qədim tarixi, etnik xüsusiyyətləri, coğrafi şəraiti, iqtisadi-siyasi durumu məsələni reallaşdırmışdır. Hər bir xalqın dinə və etiqad məsələlərinə münasibətinin formalaşmasında etnik xüsusiyyətlər önəmli, hətta başlıca rol oynayır. Bu baxımdan Alban etnosunun müsəlmanlığı qəbul etməsi onun etnik xüsusiyyətlərindən, tarixi genindən irəli gəlir. Albanlar xasiyyətcə mehriban insanlar olmuşlar. Moisey Kalankatuklu bu haqda belə yazmışdır: “Onlar (albanlar---Ə.Ə.) öz ölkələrinə Ağvan(Alban) adını ona görə vermişlər ki, Aranın özünü, yumşaq xasiyyətinə görə, “ağu” (Mehriban) deyi çağırırdılar.”(17,17.)

Qədim türklərdə tək Tanrı inancından irəli gələn haldır ki, Alban eli də islamı qəbul etmişdir. Qədim türk mifologiyasında vahid Tanrı inancı əsas amildir. Türklərin böyüyə hörmət, ata-anaya sevgi, ümumiyyətlə, bəşəri duyğulara malik olması da islamı qəbul etməyə sövq etmişdir. “Başqa sözlə, türklər insanlara münasibətlərini inanclarına yox, əxlaqi keyfiyyətlərinə görə müəyyənləşdirmişlər. Qəribədir ki, türklər “kafir” anlayışını daha çox inanc deyil, əxlaq müstəvisində işlətmişlər. Məsələn, qədim dastanlardan da göründüyü kimi, öz dinlərinə mənsub olan, amma xəyanatkar qəddar kimi tanınanları da “kafir,” “gavur” adlandırmışlar. Deməli, türklər üçün “kafir” daha çox dini yox, əxlaqi anlayışdır.” (17,99.)

Demək, türklər türk olduqları üçün islamı qəbul etmişlər. Həmçinin burada coğrafi amil də əsas şərtlərdən biridir. “Azərbaycan coğrafi baxımdan təkcə qitələrin ------ Avropa ilə Asiyanın deyil, həm də mədəniyyətlərin sərhəddində yerləşir. Ölkəmiz İslam dünyasının və mədəniyyətinin Şimal qurtaracağı, Avropanın-----Qərb mədəniyyətinin başlanğıcıdır. Başqa sözlə, Azərbaycan Avropadan baxdıqda Şərqin, Şərqdən baxdıqda isə Avropanın başlanğıc nöqtəsidir.”(17,101.) Odur ki, Azərbaycan bütün Qafqazda dini mühitin formalaşması və idarə olunması üçün mərkəz rolunu oynamışdır və oynayır. Odur ki, bütün Qafqazın şeyxi Hacı Allahşükür Paşazadədir.

Etnik formalaşma ilə dini formalaşma eyni məfhum deyildir. Odur ki, Azərbaycanda tarixi inkişaf prosesində Qafqaz albanlarının əvvəlcə xristianlığı, sonra isə müsəlmanlığı qəbul etməsi etnik formalaşma yox, dini formalaşmadır. Bunu etnik formalaşma kimi qəbul

edənlər bir sıra qaranlıq məqamları ört basdır etmək istəyirlər. Albanların çox hissəsi islamı qəbul edərək, öz etnik soylarını saxlamaqla müsəlmanlaşmışlar. Bu etnik yox, dini formalaşmadır. Albanların az bir qrupu isə erməni-hay tayfasının təsirinə məruz qalaraq onların milli etnik qrumu içərisində ərimiş, öz etnik milli alban tərkibini itirmişlər. Bu isə etnik formalaşmadır. Yəni etnik formalaşma alban türk tayfasının erməniləşməsidir. Türksoylu və türkdilli alban tayfaları türk olduğu halda necə türkləşə bilər?! Bunlar tayfa birliyindən toplum halına keçib millət kimi formalaşa bilər. Bu isə etnik formalaşma deyildir. Türksoylu və türkdilli alban tayfaları islamı qəbul etməklə dini formalaşmaya məruz qalmışlar. Xristianlıqda qalan türksoylu albanlar isə erməniləşməklə etnik formalaşmağa düçar olmuşlar. Biz vaxtilə onları “din ayrı qardaş” adlandırır, “kirvə” deyirdik. Etnik formalaşmağa məruz qalan xristian albanlar getdikcə öz (alban qıpçaqcası) dillərini də unudub erməni dilini qəbul etmişlər. Bugünki erməni dilinin qrammatikasında olan dolaşıqlıq etnik soyun dəyişməsi ilə əlaqədardır.

Ermənilər hər şeyi erməniləşdirməyə çalışdıqları kimi, xaçı da özününküləşdirib mənimsəməyə can atırlar. Harada Alban xaçı görsələr onu öz simvollarına uyğunlaşdırırlar. Halbuki, xaçın tarixi xristianlığın tarixindən daha qədimdir. E.ə. XIII-XII əsrlərdən xaç Azərbaycanda işığın, odun simvolu kimi işlənmişdir. Məsələn, Bərdə rayonunda Zümürxaç kəndi var idi. Zümür\Zımır palçıq, xaç isə od, ocaq deməkdir. Yəni bu kəndin adı palçıq ocağı mənasını verir. Bu gün də həmin kənddə müalicəvi əhəmiyyət kəsb edən yanar su ocağı vardır. Nədənsə, xaç sözündən xorrayan, “başbilənlər” onu xan sözü ilə əvəz ediblər. Zümürxaç Zümürxan (palçıq xanı) olubdur. Laçın rayonunda xalq arasında “Keş” dağı adlandırılan məkanı “Azərbaycan toponimlərinin ensklopedik lüğətində” “Keşiş təpə” (2 ,270.), yenə orada Kəlbəcər rayonundakı “Keş” kəndini “Keşişkənd”, Laçın rayonundakı Zorkeş, Qarakeş kəndlərini “Zorkeşiş”, “Qarakeşiş” ediblər. Halbuki, bu məkanlarda Kiş etnosları yaşamışdır. Kiş sözü Keş, Qis, Qiş və s. formalarda tələffüz olunub. Şəkidəki Kiş məbədi, Kiş kəndi, Kiş çayı və s. onomastik vahidlər Kiş etnosunun Alban dövründə də Azərbaycanda yaşadıqlarına əyani sübutdur.

Qədim Alban məbədləri bütün xristian dünyasında ən qədim kilsələrdir və apostol mənşəlidir. Odur ki, Qafqaz Albaniyasının ərazisi ilk xristian icmalarının meydana gəldiyi məkandır. Bu məsələni Moisey Kalankatuklu “Alban tarixi” əsərində də qeyd etmişdir. Məlumat vermişdir ki, Albaniyada eramızın II yüzilliyindən başlayaraq ilk xristian icmaları yaranıb, IV yüzilliyin I rübündə (313-cü ildə) isə Alban çarı Urnayr Xristianlığı dövlət dini elan edib. İlk xristian apostol kilsəsi Qafqaz Albaniyasında təsis olunub. Hətta Xristianlığın banisi İsa Məsihin anadan olması münasibəti ilə Şərqdən (Ə.Ə. Albaniyadan) Qüdsə gəlib,

ona səcdə qılıb, hədiyyələr təqdim edən də ilk dəfə şərqlilər olmuşlar. Bu haqda "İncil" kitabında belə yazılmışdır:

"1. İSA padşah Hirodun günlərində, Yəhudeya Beytlehemində anadan olan zaman, Şərqdən Yeruşalimə münəccimlər gəlib dedilər:

2."Anadan olan yəhudilərin Padşahı haradadır? Çünki, Onun ulduzunu Şərqdə gördük və Ona səcdə qılmağa gəldik.".....

...11. Evə girib anası Məryəm ilə Körpəni gördülər və yerə qapanıb, Ona səcdə qıldılar. Xəzinələrini açaraq Ona hədiyyələr, qızıl, günnük və mirra təqdim etdilər."(23 ,13.)

Görndüyü kimi təqdim olunan hədiyyələr dəyərli olmaqla yanaşı, Şərqin də rəmzini özündə əks etdirir. Günnük gün ölkəsinin (Şərqin) simvoludur.

VII əsrin II yarısından etibarən Xristianlıq tədricən mövqeyini itirib, 705-ci ildə Alban dövləti süquta uğrayıbdı. Albaniyanın Aran (düzən) ərazilərində məskunlaşan əhali İslam dinini qəbul edərək müsəlmanlaşıb, Kiçik Qafqazın cənub-qərbində yaşayan albanlar monofizit erməni qriqoryan dininin təzyiqi altında ermənиləşib, Kiçik Qafqazın şimal-şərq ərazisinin albanları isə diofizit gürcü-pravoslav kilsəsinin təzyiqi ilə gürcüləşibdi. Amma Udinlər isə Alban etnosu kimi bu gün də Oğuz və Qəbələ rayonlarında öz etnik xüsusiyyətlərini qoruyaraq yaşayırlar. Udilər Qafqaz Albaniyasında yaşayan tayfalardan biri olmuşdur. Udilərin dili Qafqaz dilləri ailəsinin ləzgi yarımqrupuna məxsus olub, çoxlu qədim ünsürləri özündə qoruyub saxlaya bilmişdir. Udi dilinin əlifbası yoxdur. Dünyanın etnik xəritəsində Udi adlı etnos bu gün yalnız Azərbaycanda mövcuddur. Tarixən Günəşə, Aya sitayiş edən udinlər IV əsrin əvvəllərində xristianlığı qəbul etmiş və bu günə kimi dinini qoruyub saxlamışlar. Udilərin ulu babası Qafqaz Albaniyası tayfalarından biri olan utilər olmuşdur. Utilər haqqında e. ə. V əsr yunan müəllifi Herodotun "Tarix" əsərində məlumat verilmişdir. Udi sözünə termin kimi ilk dəfə Böyük Plininin ( Iəsr) "Həqiqi tarix" əsərində rast gəlinir.

QafqazAlbaniyasının ərazicə geniş vilayətlərindən biri Uti vilayəti olmuşdur. Ərəblər Qafqaz Albaniyasını VII əsrdə işğal etdikdə utilərə islam dinini qəbul etdirirlər. Lakin onların bir hissəsi əvvəlki inamlarını saxlayırlar. O, dövrdə Alban katalikosunun qalmasına baxmayaraq, çox sürətlə alban---xristianların, o cümlədən, udilərin etnik köklərinin dəyişdirilməsi və erməniləşdirilməsi siyasəti gedirdi. Sonda isə Dağlıq Qarabağda bütün xristian albanlar bütövlükdə dil və mədəniyyətlərini itirmiş oldular.

Erməni və gürcilər ona görə islamı qəbul etməmişlər ki, o dövrdə Albaniyanın tərkibində bir tayfa kimi, az saylı qrum şəklində olmuşlar. Ərəb xilafətinin bütün tələblərinə əməl edərək lazım gəldikdə namuslarını belə qorumadan, bütün vergiləri ödəmişlər. Odur ki, onlara güzəştlər olunubdur.

## Nizami Gəncəvi yaradıcılığında Qafqaz Albaniyasının Ərmən tayfası və Ərrmən vilayəti haqqında bilgilər.

Azərbaycanın daşlaşmış tarixi yaddaş muzeyinin şah əsərlərini yaratmış, XII əsrin aynası olan dahi Nizami Gəncəvi ensiklopedik biliyə malik, bir çox sənət sahələrinin bilicisi, mütəfəkkir şair, alim kimi dünya ziyalılarının diqqət mərkəzində olmuş və bütün dövrlərdə öz yüksək dəyərini almışdır. Əlişir Nəvainin aşağıdakı kəlamları əsrlərin daş yaddaşına hoparaq bu gün dillər əzbəri olmuşdur: “Nizami söz incisi mədəninin xəzinədarıdır. Nizami “Xəmsə”si öz məzmun və mənasına görə o qədər əzəmətli və ağırdır ki, onu ölçmək üçün göylər qədər, Yer kürəsi kimi iri daş lazımdır.”

Nizami Gəncəvi dövrünün mənbələrindən yararlanaraq əbədiyaşar dəyərli əsərlər yaratmışdır:

Sözümlə əbədiyyət fərşi toxumuşam mən,

Gözümlə ürəkləri, ərşi oxumuşam mən.(34, 66.)

Nizamiyəm, xəyala dönənin biriyəm mən,

Həyacanlı sözümlə əbədi diriyəm mən.(34, 52.)

Nizami Gəncəvi dövrünün aynası olmuşdur. O, bunu özü də etiraf etmişdir:

Amansızam, mən hər şeyi əks edirəm ayna kimi...(34, 125.) Dövrünün aynası olan Nizami Gəncəvi əsərlərində erməni və Ermənistan anlayışı, məfhumu yoxdur.Əgər XII əsrdə belə bir tayfa anlayışı olsaydı Nizami heç olmazsa onun adını çəkərdi. Nizami yaradıcılığında adı çəkilən ərmən tayfası Alban tayfasıdır və yaşadığı ərazi də Ərmən torpağı adlanır ki, bu da Qafqaz Albaniyasının bir vilayətidir. Açıq aydın qeyd olunur ki, Albaniyanın dağlıq ərazisi Ərmən adlanır və orada Alban tayfası olan Ərmənlər yaşayır ki, bunlar da bu ittifaqdandır deməklə, yəni bizdəndir, yəni Albaniya ittifaqındandır. Axı Albaniya 26 tayfa ittifaqına malik olmuşlar. “Bərşad Ərməndən bu ittifaqdan”dır. (36, 321.)

“Xosrov və Şirin” əsərində belə bir başlıq var: “Xosrovun Bəhramdan qaçıb Ərmənə getməsi”.

Zəmanə Xosrova olmadı pənah,

Bəhram qarşısında məğlub oldu şah.

Müxtəlif şətrəncdə qanlı zəmanə,

“Şah” dedi Xosrova, vermədi xanə.

Yüz hiyləylə qaçıb o yan-bu yana

Yetirdi özünü Azərbaycana.

Sızlayan könlündə Şirinin dərdi,

Birbaş “Muğan” deyib atı döndərdi. (35, 115.)

Buradan aydın olur ki, Ərmən dedikdə Azərbaycan, Muğan nəzərdə tutulur. Həmçinin bütün varlığı ilə türk olan Nizami ermənıyə igid deyib onu tərifləməz. Ərmən türk oğlu türk olduğu üçün Nizami onu belə vəsv edir:

Ərməndən acıqlı igid bir cavan,

Vurub öldürməkdə cəsur pəhləvan.

Adı Şərvə, özü döyüşdə kamil,

Nə aslan tay idi ona, nə də fil. (36. 332.)

“Xosrov və Şirin” əsərində Alban ölkəsinin qış yatağı Arran, yaylaq yeri isə dağlar diyarı Ərmən olduğu qeyd olunur:

Dərbənd dənizinin bir sahmanında

Bir gözəl ölkə var dağlar yanında.

Şahzadə qadınlar orda hökmran,

Yayılmış qoşunu İsfahanacan.

Arrandan başlamış Ərmənə qədər,

Onun fərmanına boyun əyirlər

Səmira adlanır o göyçək qadın

Böyükdür mənası bu gözəl adın.

Surətdə kişidən heç geri durmur,

Böyük olduğundan Məhin Banudur.

Gün keçib gələndə yeni bir fəsil

O qurur özünə təzə bir mənzil.

Gül fəsli yamyaşıl Muğan–yatağı,

Yay zamanı yeri Ərmən torpağı.

Bərdənin havası çox mötədildir,

Hər il qış zamanı o bura gəlir.(35, 64.)

Bir daha aydın olur ki, Arrana və Ərmənə hakim olan Alban hökmdarı Məhin Banunun yaylaq yeri Ərmən torpağıdır və Ərmən torpağı Qafqaz Albaniyasının bir vilayətidir. Odur ki, bu vilayət əhli bir zamanlar atəşpərəst olmuşlar. Nizami "İsgəndərnamə" əsərində bu barədə belə qeyd etmişdir:

Böyük Azərbaycan hökmdarından

Bir elçi gələrək dedi: "Hökmüran,

Nə üçün ram etdin bütün dünyanı?

Sildin ruzigardan zülmü, tüğyanı?

Verdin hər ölkəyə qurtuluş, aman

Ərmənə nədən süst baxdı hökmran?

Doğduğun şəhərə bu yaxın ölkə,

Nə üçün bürünsün qaranlıq kölgə?

Ərməndə atəşə ibadət edər,

Başqa padişaha itaət edər.

Orda Ad nəslindən bir pəhləvan var

Qüvvəti Rüstəmin gücünə çatar.

Adı Dəvalidir, hər bağrı yarır,

Aslan dərisindən yosun qoparır.

Ərməndə yaşayan bütün igidlər,

Yalnız bu padşaha boynunu əyər.

Hər kəs badə içər onun adına,

Yaxın ölkələrdən bac gəlir ona.

Ordunla bu səmtə hücum etməsən

Ölkəni, şübhəsiz, alacaq bizdən”. (36, 119.)

Sitatdan bəlli olur ki, Azərbaycana məxsus Ərmən Dəvaliyə boyun əydiyi, ona tabe olduğu üçün Azərbaycan hökmdarı elçi göndərib ölkələr fəth edən İsgəndərdən kömək diləyir və əgər bizə kömək etməsən, “Ölkəni, şübhəsiz, alacaq bizdən”—söyləyir.

“VIII əsrin başlanğıcında Albaniya ərəblər tərəfindən Arran (ər-Ran, Aran) adlanmağa başladığı dövrdə “Ərminiyə” adlı yeni ərəb inzibatı adı meydana gəldi. Bu adla tanınan əraziyə Ermənistan, Albaniya və İberiya torpaqları daxil idi. Yeni ərəb inzibati termininin adı çəkilən ölkələrə şamil edilməsi  Bizans imperatoru  I Yustinianın (527-565) islahatları(536) nəticəsində yaranmış bizans Ermənistanı inzibzti vahidinin adı ilə bağlı olmuşdur. Həmin inzibati islahata əsasən Ərminiyə adlanan ərazi bilavasitə Bizans ərazisində (Müasir Türkiyə ərazisində)------Qara və Aralıq dənizləri arasında idi və 4 sahəyə bölünürdü. “Ərəb  Ərməniyəsi” inzibati adının yaranmasına başqa obyektiv səbəblər də təsir etmişdir; belə ki, ərəblər Azərbaycana qədəm basmamış (639-640-cı illərdə) Mesopotamiyada yürüş zamanı Bizansın tabeliyində olan “Ərməniyyə” adlanan əraziləri ələ keçirmiş, digər tərəfdən ərəb işğal zonasını idarə edən canişinliyin qərargahı həmin dövrdə ermənilərin baş şəhəri olmuş Dəbildə-Dvində yerləşirdi. Təbii ki, özlərindən əvvəlki Bizans inzibati-idarə sisteminə varis durmuş ərəblər, başqa yerlərdə olduğu kimi, burada da köhnə dövrə dair “Ərminiyə” adını saxlamışlar. Ərəblər sonralar işğal etdikləri yeni həmhüdud əraziləri də tabeliklərində olan əraziyə birləşdirmişlər. Dvin tərəfdən Albaniya və Gürcüstan ərazilərinə daxil olan ərəblər Qafqazda tutduqları başqa torpaqları azərbaycanlıların, gürcülərin, ləzgilərin və başqalarının yaşadığı əraziləri də əvvəlki işğal zonasına qatmış və bu yerlərin hamısını, idarəetməni asanlaşdırmaq məqsədilə, əllərində olan Ərminiyə vilayətinin adı ilə adlandırmış və onun idarəsini Dvindəki canişinə həvalə etmişlər. “Ərminiyə” inzibati adının sonralar nisbətən daha Şərq ərazilərə şamil olunmasında isə ərəblərlə əks cəbhədə olan Bizansa qarşı dini-ideoloji mübarizə aparan erməni din xadimlərinin rolu da müəyyən mövqe tutmuşdur. Eyni zamanda Xilafətin qərəzli siyasəti nəticəsində alban kilsəsinin erməni kilsəsinə tabe edilməsi və bununla əlaqədar bütün Arran və Ermənistan xristianlarına real rəhbərliyin erməni katalikosunun əlində cəmlənməsi, Albaniyanın özünün isə bir dövlət kimi süqutu həmin prosesin inkişafına təkan verdi.

Erməni din xadimləri, kahinləri yeni-yeni ərazilərə sahib durmaq niyyəti ilə əvvəllər bilavasitə Bizans ərazisində mövcud olmuş Ərminiyələrin tədricən Cənubi Qafqazdakı ərazilərə şamil edilməsində əllərindən gələni etdilər. Odur ki, Bizans ərazisindəki 4 Ərminiyə ilə ərəblər dövründəki 4 Ərminiyə bir-biirindən fərqlənirlər; başqa sözlə ərəb



müəlliflərinin şərh etdikləri 4 Ərminiyə I Yustian dövrünün 4 Ərmiyəsi ilə uyğun gəlmir.

“Ərminiyə” termini ilk vaxtlarda ərəblər tərəfindən şərtsiz qəbul olunmuşdur. “Ərminiyə” istilahı altında böyük bir ərazi nəzərdə tutulurdu və İbn Xordaldbeh, Əl-Bəlazuri, Əl-Yaqubi, İbn Əl-Fəqih və s. ərəb müəlliflərinin əsərlərində əks olunduğu kimi, 4 yerə bölünürdü:

I Ərminiyə Qafqaz Albaniyasının, ərəb istilahı ilə, Aran ərazisini əhatə edirdi.

II Ərminiyə ərəb tarixçilərinin yazdığına görə, əsasən gürcülərin, ləzgilərin və başqa dağlıların məskunlaşdıqları əraziləri əhatə edirdi.

III Ərminiyə Arazın aşağı axarının sağ sahillərini, Göycə gölünün qərbi ilə Van gölünün şərqini və şimali-şərqindəki əraziləri əhatə edirdi.

IV Ərminiyə III Ərminiyədən daha qərbdə Xilat tərəfdə olan ərazilərdə mövcud olmuşdur. Göründüyü kimi, Xilafətin Cənubi-Qafqazdakı I və II Ərminiyə inzibati bölgüləri şimalda Tiflis və Dərbənddən cənubda Araz çayınadək, qərbdə Kiçik Qafqaz dağlarından şərqdə Xəzərə kimi olan sahəni əhatə edir və əsasən ərəblərin Arran adlandırdıqları qədim Albaniya torpaqlarını birləşdirirdi. Artıq IX əsrin sonlarından başlayaraq ərəb tarixçiləri

Xilafətin Cənubi Qafqazdakı vilayətlərini dəqiq sərhədləndirməyə və adlandırmağa başladılar və "Ərməniyə" termini də aradan çıxdı. Bunun əsas səbəbi bizans ilə müharibələrə başı qarışmış Xilafətin Qafqazdakı hadisələrə lazımi diqqət yetirə bilməməsi idi. Sonralar Azərbaycan Arran və Ermənistan formal olaraq vahid Qafqaz canişinliyi – vilayəti tərkibində birləşdirildi və xəlifənin valisinin idarəsinə verildi. Xilafətin zəifləməsi nəticəsində isə I və II Ərməniyə bölgələrinin tərkibindəki Şimali Azərbaycan torpaqlarının bir qismi mənşəcə ərəb olan məzyədilərin əlinə keçdi və onlar 861-ci ildə Şirvanşahlar dövlətini təsis etdilər. Lakin, "Ərməniyə" termini sonralar işlədilməsə də, ilk ərəb müəlliflərinin öz əsərlərində bu termini işlətmələri müasir ermənilərin yersiz torpaq iddiaları irəli sürmələrinə vasitə oldu." (38, 44-45.)

Buradan da bir daha aydın olur ki, Ərmən Alban vilayətidir və Azərbaycana məxsusdur. Əgər XII əsrdə Nizami dövründə "erməni" adı mövcud olsaydı, hökmən Nizami kimi inci seçib dürr axtaran bir sərrafın qələmindən yayınmazdı, ümumiyyətlə, "erməni" etnosu olmamışdır. Bu başımıza bəlalar açan qondarma bir siyasi gedişin oyunudur. Bu oyunu başımıza açan ruslardır ki, 800 il bunddan öncə dahi Nizami Gəncəvi onlara məxsus nə söyləmişsə, bu gün onun nəticələri göz önündədir. Nizami yazmışdır:

Şox keçməz ki, ruslar keçər hər yana,

Rumu, həm Ərməni qoyar virana.

Elə ki, keçirər ələ xəzinə,

Durmayıb tələsik qaçarlar yenə.

Şəhərlər alaraq, talar hər yanı,

Bəlkə də tutarlar bütün dünyanı.

Onlarda aslanla qurd ürəyi var,

Qana mərd, süfrəyə aciz olurlar.

Ruslardan adamlıq gözlənməz bir an,

Yalnız surətindən görünər insan.

Eşşəyin cəvahir olsa da yükü

Yenə də eşşəkdir, parıldar tükü.

Madam ki, yol tapmış bunlar xəzinəyə,

Sarıca VIII əsrdə Qarabağın güclü oymağı idi. Əhməd bəy Cavanşir yazır ki, Pənah xan Cavanşir elinin Sarıcalı oymağından çıxmışdır.

XIX əsrin ortalarında Qazaxlı tayfasının bir qəbiləsi Sarıcalı adlanırdı. Orta Anadoluda yaşayan yürük elinin bir oymağı Saraclı olmuşdur. İndi Gürcüstanın Marneuli rayonunda Saraclı, Azərbaycanın Ağcabədi bölgəsində Sarıcalı kəndləri var.”(27,237). Şəki rayonunda olan Sarıca kəndi də “Sarıca” tayfasının adını daşıyır.

Demək, indiyə qədər izah olunduğu kimi deyil, yəni Sarıcalı--- sarıca Alının adını daşımır, sarıca tayfasının adını daşıyır.

**Qaravəlli kəndi**----Bu kəndin adı Mil (Bel) tayfasının adından yaran mışdır. “Mil (Bel) Azərbaycanın köçəri elatlarından biri idi. 1875-ci ildə tərtib edilmiş etnoqrafik məlumatlar toplusunda göstərilir ki, Milli tayfası türk dilində danışır.

Bellərin bir qanadı olan Qara Bel son mənbələrdə Qaravəlli adı ilə qeydə alınmışdır. Bel teonimi ilə bağlı Kəlbəcərdə üç Milli kəndi var. Ölkəmizdəki Mil düzü bellərin yurdu olmuşdur. XX əsrin önlərində Quba qəzasında Ağbil, Cavad və Şamaxı qəzalarında Qaravəlli kəndləri vardı”(27,16). Bu gün isə Qaravəlli kəndi təkcə Ağcabədidə deyil, Ağsuda, Balakəndə, İmişli və Şamaxıda da Qaravəlli kəndləri vardır.

Demək, Qaravəlli adı Qara Bel tayfasının bu ərazilərdə məskunlaşması nəticəsində yaranmışdır.

**Pərioğullar kəndi—**Rəvayətə görə İbrahim xanın Pəri arvadın oğullarına bağışladığı ərazidə Pərinin oğulları məskən salıb yaşadıqları üçün bu kənd Pərioğullar adlandırılıb. Hətta xalq arasında söylənilir ki, İbrahim xan deyərmiş:

Hər ağacdan masan olmaz,

Hər igiddən Həsən olmaz,

Hər oxuyan Molla Pənah,

Hər qatırçı Murad olmaz.

Deyilənə görə bu ifadələri İbrahim xan söyləmişdir.

–Hər ağacadan Masan olmaz–deyimi çox qədim dövrlərlə səsləşir.Masan yer əkmək üçün alətdir, ağacdan hazırlanır. Buna cüt və yaxud xış da deyiblər. Meşədə hər ağacdan

onu düzəltmək olmazmış, çünki Masanın üç qolu olur və iki dirsəkli ağacdan hazırlanır. İki qoldan majgal tutur, bir qol isə öküzün boyunduruğuna bağlanır. Məncə, Masan, xış, cüt, maj, majgal, kiş, hodaq və s.bu kimi əkinçiliklə bağlı sözlər ulu dilimiz olan Şumer (Şumər) dili ilə bağlıdır:

Kotanın hodaqları,
Bar tutub dodaqları,
Qarğaram kotan sına,
Dağıla hodaqları.

–Hər igid Həsən olmaz–deyimi ilə bağlı xalq arasında belə bir yozum işlənir.Söyləyirlər ki,Pəri adlı xanımın əri ölür və oğlanları yetim qalır. Pərinin Həsən adlı oğlu uşaq vaxtından cəsur, bacarıqlı və qorxmaz olur. Bir gün İbrahim xan başının atlı dəstəsi ilə ovdan gəlirmiş, görür ki, bir neçə uşağı bir uşaq sıraya düzüb əsil hərbiçi kimi təlim keçir. İbrahim xanın bu mənzərə diqqətini cəlb edir və təlim verən balaca uşağa yaxınlaşıb soruşur:Ay uşaq, adın nədir?

–Həsən.

Kimin oğlusan?

–Pərinin.

Mənimlə Qalaya (Şuşa Qala adlanırmış) gedərsənmi?

–At versəniz gedərəm.

İbrahim xan balaca uşağın belə cəsarətə malik olmasından xoşu gəlir və Həsəni özü ilə götürüb Qalaya aparır. Həsənin haraya və kiminlə getməsini bilməyən Pəri ana şivən qoparır ağı deyir:

Mən aşiqəm ha səni,
Haqq saxlasın Həsəni,
Xəstə könlü nar istər,

Mənim könlüm Həsəni.

Həsən İbrahim xanın sarayında bir müddət qalıb təlim alır,ən yaxşı bir döyüşçü kimi yetişir. İbrahim xanın sadiq döyüşçüsü olur. Odur ki, İbrahim xan ona mülk verdikdə Həsən Törə təpədə olan Məxmər yatağını istəyir.Həmin mülk Pəri oğullarına verilir. Pəri oğulları burada məskən salıb yaşadıqları üçün oranı Pəroullar adlandırırlar. Həsənin cəsurluğu, igidliyi dillərə düşür, dastanlaşır; ”Hər igid Həsən olmaz”– ifadəsi belə yaranır.

–Hər oxuyan Molla Pənah olmaz ifadəsi də İbrahim xanla bağlı formalaşmışdır. Molla Pənah Vaqif Qarabağa gələn zaman mirzəlik və mollalıq edirmiş. Ədəbi –nəzəri fikirdə məlum olduğu kimi Vaqif İbrahim xanın sarayına dəvət olunduqda əvvəlcə eşikağası, daha sonra isə vəzirlik rütbəsinə yüksəlmişdir. Ona görə də, onun haqqında belə deyim formalaşır ki, hər oxuyan molla vəzirlik rütbəsinə yetişə bilməz, amma Vaqif yüksələ bilər. Odur ki, “Hər oxuyan Molla Pənah ola bilməz” deyimi bu gün də məsəl kimi işlənməkdədir.

–Hər qatırçı Murad olmaz. Bu ifadənin yaranmasını Hacısamlı bəyi Paşa bəyin atası Nəbi oğlu Murada aid edirlər. Lakin bu ifadə Ağdamda yaşamış Alverdi oğlu Murad haqqında deyilmişdir. Deyilənə görə Ağdamın Muradbəyli kəndi Alverdi oğlu Muradın şərəfinə belə adlandırılıb.

Belə söyləyirlər ki, Murad İbrahim xanın qatırçısı olub. O qatıra, ata elə qulluq edərmiş ki, heç kim onun işini görə bilməzmiş. Bir dəfə İbrahim xanın mindiyi ayqıra elə qulluq edir ki, at bədlik edir xan onu minməkdə çətinlik çəkir. Xan bu sirri öyrənmək üçün Muradın qulluq üsuluna müşahidəçi təyin edir. Müşahidəçilər görürlər ki, Murad peyini əzib at və qatırların saxlandığı yerə səpdi və peyinin yumuşaq olub-olmadığını yoxlamaq üçün soyunub həmin yerdə at kimi ağnamağa başladı. Harada bədənini əzən peyin qurusu tapdısa elə oradaca onu əzdi və rahatladı. Beləliklə atın və qatırın birinci yerini rahat edib sonra onların yemini verdi. Demək, onun qulluq üsulunun sirri bunda imiş. Müşahidəçilər bu sirri xana olduğu kimi danışırlar. Xan Muradın öz işinə belə canıdildən bağlı olduğunu görüb, ona bəylik verir və yaşadığı kəndi onun şərəfinə Muradbəyli adlandırır. Ağdamda

məşhur şəxsiyyət olan Qara bəy Murad bəyin nəvəsidir, Hacısamlı Paşa bəyin qızı Ziba xanımın həyat yoldaşı olub.

Elmi ədəbiyyatda isə Pərioğullar adının leksik elmi duyumu belə çözülür: "Türk mifolojisində Tanrı övladlarından fərqli olaraq Pəri oğlanları insanların bədxahı kimi görünürlər. Pəri oğlanlarından biri Təpəgöz idi. Oğuzların bədxah pərilər qarşısında qorxusu Pəriavul və Pərili etnik adlarının yaranmasına səbəb olmuşdur.

Abbasqulu ağa Bakıxanov yazır ki, Dağıstanda Pəriavul adlı kənd vardı. Indi Ağdam və Ağcabədidə Pərioğullar kəndləri var.

Pəriyə pərəstiş edən adamlar xristian albanlar arasında da olmuşdur. Albaniyanın dağlıq vilayətlərindən biri Parisos adlanırdı. 1139-cu il zəlzələsində Parisos şəhəri və vəngi dağılmışdır". (27, 48).

Bu barədə antik dövr qaynaqlarında müəyyən məlumatlar öz əksini tapmışdır. Yunan coğrafiyaçı və tarixçisi Strabon e.ə. yazdığı kitabında qeyd etmişdir ki, Albaniyada amazonkalar yaşayırlar. "Onların sağ döşünü uşaq vaxtında yandırırlar ki, hər cür iş görəndə, xüsusilə nizə atanda sağ əldən sərbəst istifadə etsinlər. Onlar həmçinin ox-yay, döyüş baltası və yüngül qalxan da çox işlədirlər... Yazdakı 2 xüsusi ayda onları qarqarlardan ayıran qonşu dağa qalxırlar. Çox qədim bir mərasimə görə isə, qarqarlar da həmçinin bu dağa çıxırlar ki, qadınlarla birlikdə qurban verib uşaq doğmaları üçün onlarla yaşasınlar; kim kimlə düşdü, onlar xəlvət, qaranlıqda görüşürlər; qadınları hamilə edərək, qarqarlar onları evlərinə buraxırlar. Qadın cinsindən olan bütün körpələri amazonkalar özlərində saxlayır, kişi cinsindən olanları isə tərbiyə olunmaq üçün qarqarlara verirlər. Hər bir qarqar ona gətirilən hər hansı körpəni görmədən-bilmədən öz oğlu sayıb onu qəbul edir."(1,19). Burada verilən bilgiyə dirsəklənib deyə bilərik; Pəri oğulları amazonkaların qarqarlara verdikləri oğullardır ki, Qarqar çayının sahilində kənd salıb yaşayıblar. Ona görə də bu kənd Pərioğullar kəndi adlandırılıb.

"Minlərlə söz --- minlərlə sənəddir. Bu sənədləri oxuya bilməklə---sözün arxeloqu olmaqla elmi daha da zənginləşdirmək, tarixi saxtalaşdırmadan xilas etmək olar."(14,315).

Araşdırmalarımızdan bəlli oldu ki, həqiqətən də Ağcabədi türk uluslarının yaşayış məskəni olmuş və Oğuz yurdu kimi "Kitabi-Dədə Qorqud" eposunda Ağcaqala adlandırılmışdır. Kaş elə həmişə bu torpaqlarda Ağca türk etnosu qala, yaşaya və bu məkanımız da Ağcaqala adlana.

## Laçın rayonu ərazisində formalaşan qədim və ortaq Türk adları.

Vahid millətə mənsub olan çoxsaylı Türk xalqları tarixən dünyanın müxtəlif ərazilərində məskunlaşmışlar. Bu faktı qoruyub saxlayan Türk mənşəli onomastik vahidlərdir. Türk mənşəli onomastik vahidlər dünya miqyasında — Balkanlarda, Bolqarıstanda, Rusiya Federasiyası, Orta Asiya respublikaları, Türkiyə, İran, İrak, Zaqafqaziya və s. ərazilərdə geniş yayılmışdır. Bu da Türk xalqlarının tarixən geniş ərazilərin sahibi olmasından xəbər verir.

Azərbaycanın böyük strateji əhəmiyyət kəsb edən Laçın bölgəsində də ortaq Türk adları geniş yayılmışdır. Bu isə Laçının qədim Oğuz yurdu, Türk uluslarının yaşayış məskəni olmasından xəbər verir.

Laçın rayonu ərazisində qorunub saxlanılan qədim Türk mənşəli alaşar (alışar), art, bair, bay, parmaq, bet, bük, yazı, kömür, sarp, çal və s. terminlər bəzi onomastik vahidlərin tərkibində bu gün də işlənməkdədir. Belə sözlərdən bir neçəsinə diqqət yetirək.

Alaşar (alışar) sözü qədim Türk dillərində “alçaq dağ” mənasında işlənir. Laçın rayonunda Alaşar qaya adlanan yer vardır.

Art sözü qədim Türk mənşəlidir, “dağ keçidi”, “aşırım” və s. mənaları bildirir. Salvard zirvəsi, Salvard yaylası.

Bair qədim Türk dillərinə aid sözdür, “təpə”, “yüksəklik”, “dağ tirəsi” və s. mənalarını bildirir. Çalbair dağı Dambulaq kəndi yaxınlığındadır. Çal sözü türk dillərində “təpə”, “daş” mənası bildirir. Çalbayır sözündə bayır komponenti “dağ döşü”, “yamac” mənasında işlənmişdir.

Bay sözü qədim Türk dillərinə aiddir, “varlı” mənasındadır. “Kitabi - Dədə Qorqud” dastanında da bu sözə rast gəlirik. “Qadir Tanrı verməyincə ər bayımaz.” (28, 19.) XVI−XVII yüzilliklərdə Laçın rayonunda yaşayıb yaratmış və Laçın rayonunun Güləbird kəndi yaxınlığında məqbərəsi olan, bayatı ustası Sarı Aşiq də bağlama xarakterli bayatılarından birində  bay sözünü qədim və ilkin anlamında işlətmişdir:

Mən Aşiq bayı keçdim,

Kasıbı, bayı keçdim.

Altı camış, yüz keçi,

Qucaqda çayı keçdim.

Laçın rayonunun Mirik kəndi yaxınlığında Bayqara dərəsi adlanan yer vardır.

Parmaq sözü qədim Türk dillərinə aiddir, "təpə" anlamında işlədilir. Laçın rayonunda Barmaqlar dağı vardır.

Bet sözü bat şəklində də işlənir. "Dağın yamacı", "dağın döşü", "yüksəklik" mənalarını bildirir. Laçında Çarçanbent dağı, Çarçanbent təpəsi qeydə alınmışdır.

Bük sözü qədim Türk dillərində "dar yarğan", "dağ keçidi", "ensiz dağ vadisi" və s. mənalarında işlənir. Minkənd kəndi yaxınlığında  Büktəpə adlanan yer vardır.

Yazı sözü qədim Türk dillərində "çay, dəniz kənarı", "çöl", "düzən" mənalarında işlənir. Laçın rayonunda Ağcayazı kəndi, Ağcayazı dağı, Ağcayazı düzü, Ağcayazı təpəsi, Ağcayazı çölü vardır.

Sarp sözü qədim Türk dilində "uçurum", "çətin keçilən qaya", "sıldırım dağ" və s. mənalarda işlənir. "Kitabi – Dədə Qorqud"da da sarp sözü işlənmişdir. "Sarp yürirkən Qazılıq ata namərd yigit binə bilməz, binincə binməsə, yeg!" (28, 20.) Laçın rayonunun Mişni kəndi yaxınlığında Sapavur — Sarpavur təpəsi qeydə alınmışdır.

Qeyd olunmuş real faktlara əsaslanaraq deyə bilərik ki, Laçın rayonu ərazisinə aid qədim Türk mənşəli onomastik vahidlərin bu günə qədər qorunub saxlanılması Türkdilli tayfaların bu yerlərin ən qədim sakinləri olmasını təsdiq edir. Həmçinin burada yaşayan sakinlər də türk olmuşlar ki, bu günə qədər tarixi reallığı qoruyub saxlamışlar. "Laçın rayonunun ərazisi qədim dövrlərdən başlayaraq Azərbaycan xalqının təşəkkül prosesində iştirak etmiş türk uluslarının yaşayış məskəni olmuşdur. Ona görə də istər qədim istərsə də müasir el-oba adlarını köksündə yaşadan bu qədim Azərbaycan diyarının toponomiyasının əksər hissəsini milli dil vahidləri hesabına yaranan yer adları təşkil edir." (13, 7.)

Laçın rayonu ərazisində tarixən nəsillər dəyişsə də bu yerlərin ilk sakinlərinin toponimlərdə qoyduğu izlər, adlar dəyişməz olaraq qalır. Odur ki, Türk xalqlarının keçmişin özündə yaşadan etnonim mənşəli yer adları yüzlərcədir. Bunlara əsasən müəyyənləşdirmək olur ki, hansı etnoslar burada vaxtilə məskunlaşmışlar. Burada tarixən məskunlaşan türkdilli tayfanın və həmin tayfanın adı ilə adlanan toponimin adlarına aşağıdakıları misal göstərmək olar:

Laçın tayfası ------- Laçınkənd kəndi.

Minq/mink tayfası ------- Minkənd kəndi.

Maq, mağ/muğ tayfası ------- Mağouz dərəsi.

Quşçu tayfası ------- Quşçu kəndi.

Abdal tayfası ------- Abdallar kəndi.

Boz ulusu, tayfası ------- Bozlu kəndi.

Peçənə ulusu, eli ------- Piçənis kəndi.

Çor tayfası ------- Çorman kəndi.

Sadak tayfası ------- Sadınlar kəndi.

Siraq (çiraq) tayfası ------- Çiraqlı kəndi.

Bayandur tayfası ------- Bayandur kəndi.

Qızılca tayfası ------- Qızılca kəndi.

Bozdağanlı tayfası ------- Bozdağan kəndi.

Alpout tayfası ------- Alpout kəndi.

Ağca tayfası ------- Ağcayazı kəndi.

Qılıclı tayfası ------- Qılıclı kəndi və s.

Belə Türkdilli tayfaların və toponimlərin sayı Laçın rayonu ərazisində 100-dən çoxdur. “Belə etnooronimlərin mənşəyinin izah edilməsi ilə biz bir növ Azərbaycanın qədim əhalisinin etnik tərkibini və tarixini, Azərbaycan xalqının soy kökünü öyrənmiş oluruq. Laçın rayonunda yerləşən Abdal dağı, Abdal dərəsi, Abdal təpəsi oroqrafiq obyektləri etnonimlə bağlı olan oronimlərdəndir.....

1588-ci ilə aid olan mənbədə Qarabağ düzündə Həsən Abdallı elinin yaşadığı da göstərilir. Abadel/abdal tayfasını akademik V.V. Bartold Hun tayfası hesab edir. A.A. Bakıxanov da Abdal adlı tayfanın hələ çox-çox əvvəllər Azərbaycanda yaşamasını qeyd etmişdir. Türkiyədə, Başqırdıstanda, Qazağıstanda, Türkmənistanda, Qırğızıstanda və Özbəkistanda (Qaraqalpaq) da Abdal adlı oykonim və oronimlər mövcuddur. ” (33, 18.)

Verilmiş sitatdan bir daha aydın olur ki, qədim və ortaq Türk adları Laçın rayonuna aid onomastik vahidlərin əsasını təşkil edir.

Laçın rayonu ərazisində qeydə alınmış ortaq Türk adları sırasında Həkəri çayının adı daha önəm daşıyır. Belə ki, bu ad İranda, Türkiyədə, Azərbaycanda və Tacikistanda da qeydə alınmışdır. Ortaq Türk adları içərisində geniş yayılan vahiddir. "Uzunluğu 129 km-dir. Bu çayın adı indiyə qədər həm coğrafi, həm də digər mənbələrdə isə Akarlu, Ankara, Akeri kimi qeyd olunur. Bizə görə, bu çayın adı Türkiyədəki Həkəri mahalının adından götürülmüşdür. Qədim mənbələrdə bu çayın adı Aqvan–Alban şəklində qeyd edilmişdir. Çayın əsl adının Həkəri olması haqqında bəzi subutlar da vardır. Qubadlı rayonu ərazisində Həkərli adda kənd olmuşdur. Bu, vaxtilə buraya Həkəri qəbilələrinin köçüb gəlməsi, kənd salması, bu yeri isə öz tayfalarının şərəfinə adlandırması fikrini söyləməyə əsas verə bilər." (30, 44.)

Həmçinin XVI–XVII əsrlərdə də bu çayın adının Həkəri olduğunu o dövrdə Laçın rayonunda yaşayıb yaratmış bayatı ustası Sarı Aşiq də bayatılarının birində belə vurğulayır:

Mən Aşiq, ha Kərim

Dada yetiş, ha Kərim

Sənə, sənin gen dünyan

Mənə, mənim Həkərim.

Deyilənə görə Sarı Aşiq İran Hökmdarından saraya dəvət alır və cavabında həmin bayatını söyləyir. Burada Həkərim dedikdə şair açıq aydın elim, obam, ulusum demişdir. Demək, XVI–XVII əsrlərdə Həkəri eli var imiş.

"Əyrək oyk. Sadə. Laçın r-nunun köhnə kənd i. ə. v.-da kənd. Qarabağ silsiləsinin yamacındadır. Əyrik, Əkərək, Aqarak, Akarak variantlarında da qeydə alınmışdır. Tədqiqatçıların fikrincə, oykonim mənşəcə Şumer dilinə aid aqar/akar (əkin yeri, əkilən sahə) sözü ilə bağlı olub, "sahibkar mülkü", "sahibkar təsərrüfatı" mənasındadır." (2, 189, I cild)

Burada maraq doğuran odur ki, Həkəri adının qədim ifadə tərzləri verilir və Əkərə adlandığı da qeyd olunur. Bu da yuxarıda öz əksini tapmış və aqar/akar deyimlərinə uyğun gəlir. Yəni Əkərə çayı "əkin yeri", "əkilən sahə"lərin suvarıcısı mənasında, yerin əkərinə uyğun suvarılması üçün yararlı çay mənasını verir. Əkərinə sözü bu gün də dilimizdə işlənir. Məsələn, bu sahəni əkərinə şumlamaq lazımdır. Yaxud da bu işi əkərinə (axarına)

salmaq lazımdır. Demək, Həkəri xalis Türk sözüdür. Laçın rayonu ərazisində ortaq Türk adlarının çoxluğu bu diyarın Türk dünyasının bir parçası olduğunu sübut edir.

## Şumer Azərbaycan etnik birliyi və eyniliyi

Tarixi mənbələrdən bəllidir ki, indiki Ərəbistan yarımadası və Afrika sərhədlərinədək olan ərazilər qədim türk torpaqları olmuşdur. Həmin ərazilərdə e.ə. IV-II minilliklərdə şumerlər yaşamışlar. Şumerlər İkiçayarasının (Dəclə və Fərat çayları) sakinləridirlər.

“Qədim Şumeristan Azərbaycana bilavasitə bitişik olub. Türk ellərinin heç biri şumerlərlə belə coğrafi yaxınlığa malik olmayıb. Odur ki, şumer dilinin sözləri müasir türk dillərinin hamısından daha çox Azərbaycan dili ilə səsləşir.” [14,12]

Azərbaycan xalqının **Ümummilli Lideri Heydər Əliyev** demişdir: “Hər bir xalqın milliliyini, mənəvi dəyərlərini yaşadan, inkişaf etdirən onun dilidir. Dil böyük bir aləmdir.”[21,49].

Şumer dilində olan sözlərin tipoloji, genoloji təhlili, leksik məna anlamı və semantik çalarları başqa türk dillərinə nisbətdə daha çox Azərbaycan –türk dilinə uyğun gəlir. Qədim şumer dövründə işlənən sözlər bu gün dilimizdə bir səs dəyişikliyinə belə uğramadan işlənir və eyni məna anlamını bildirir. Məsələn: Adam, baba, amin, dib, dur, qor, iy (cəhrə iyi), yer, xış, faraş (tez), tava, par (od), yaz (maq), qut (qüvvə), saray, de, deş, qur, Şuşa (şəhər), Alar (Biləsuvarda Alar kəndi), Allar (Cəlilabadda Allar kəndi), qal (maq), şal, saman, kiş və s.

Dünyada elə bir dil yoxdur ki, dil ailələrindən təcriddə mövcud olsun. Odur ki, şumer dili də aqlyunativ (iltisaqi) dillər qrupuna daxildir. Dil faktları, inam, inanc, adət-ənənə, elmi-fəlsəfi, etik-estetik təfəkkür paralelləri tam əsas verir deyək ki, müasir Azərbaycan-türk millətinin ulu əcdadları qədim “Avesta”nı yaradanlar və şumerlərdir. Bunu dünyaya bəyan edən Azərbaycan alimlərindən Tofiq Hacıyev, Aydın Məmmədov, Elməddin Əlibəyzadə, Əjdər Fərzəli, Ağamusa Axundov, Firudun Cəlilov, Əlisa Nicat, İsmayıl Vəliyev, Qara Məşədiyev, Nizami Cəfərov, Tofiq Əhmədov, Kamil Vəli Nərimanoğlu, Vəli Həbiboğlu və başqaları olmuşlar. Türk alimi Əhməd Cavad sübut etmişdir ki, yeddi min yaşı olan “Avesta”nın yarandığı məkan Azərbaycandır.

“Norveç xalqının dahi oğlu Tur Heyerdal dünyaya sübut etdi ki, Şumer və Qobustan mədəniyyətləri eyni mədəniyyətdir və e.ə. VI-IV minilliklərdə Şumerin çiçəkləndiyi dövrdə Qafqazın şərqində, indiki Azərbaycan ərazisində yaşayan yerli-xalq aserlər (yəni: Azərlər!) adlanıb. ” [14,35]

Dünya alimlərindən Q.Vinkler, D.Q.Reder, M.Belitski, F.Qommel, S.N.Kramer və

başqaları şumerlərin türkdilli olduqlarını etiraf etmişlər. Azərbaycan alimləri Elməddin Əlibəyzadə və Əjdər Fərzəli inandırıcı dəlillərlə şumer türklərinin şumer azərbaycanlıları olduqlarını sübut etmişlər.

“Məşhur türk dilçisi professor Osman Nədim Tuna iyirmi ildən artıq şumer-türk dillərinin əlaqələri üzərində araşdırmalar apardıqdan sonra bu dildə 168-dən çox türk mənşəli sözün olduğunu sübut etmişdir. [11,55.]

“Avesta”, Şumer və Azərbaycan dilində işlənən aşağıdakı müqayisəyə diqqət yetirək:

| **“Avesta” dilində** | **Şumer dili** | **Müasir Azərbaycan dili** |
|---|---|---|
| Ari-təmiz, | Ari-təmiz, | Ari-təmiz |
| An-ana, | An-ana, | Ana |
| Aq-ağ | Aq-ağ | Ağ |
| Ada-adam, | Adam, | Adam |
| Baqa-ağa, bəy | Baqa-bəy | Bəy |
| Uruk | Uruk | Uruk-turuk və.s |

Misallardan da göründüyü kimi altı-yeddi min il ərzində bu günümüzlə müqayisədə cüzi fonetik dəyişiklik olsa da, heç bir məna dəyişikliyi yoxdur. Buradan aydın olur ki, “Avesta”, Şumer və Azərbaycan dilində sözlərin müştərəkliyi dillərin ilkin başlanğıcdan, ana dildən, ulu dildən törəndiyi bir daha sübut edir. Bu ilkin və ulu dil “Avesta”nın dilidir, Şumer-Azərbaycan Türk dilidir.

Dil mədəniyyətinin tarixi bəşəriyyətin tarixi qədər qədimdir. Hər bir xalqın milli mənliyi onun dilində əks olunur. Xalqın ictimai-iqtisadi, elmi-fəlsəfi, etik-estetik təfəkkürünün daşıyıcısı olan dil haqqında Firudun Köçərli belə demişdir; “Ana südü bədənin mayası olduğu kimi, ana dili də ruhun qidasıdır, millətin mənəvi diriliyidir”. Doğrudan da, yer üzündən silinmiş xalqlar və millətləri mənən yaşadan onun dilidir. Belə xalqlardan biri də şumerlərdir. Şumerlər xalq, millət kimi formalaşıb elə bir milli mədəniyyətə sahib olmuşlar ki, bu gün onlar yer üzündən silinib yox olsalar da, şumer sivilizasiyasının xəzinəsindən dünya xalqları mənbə kimi istifadə etmiş, özününküləşdirmişlər. Bu barədə Xaqani Ədəboğlu “Unudulmuş Turanın çöl çiçəkləri” əsərində belə yazmışdır: “Şumer ərazilərindən tapılmış mədəni abidələr çoxdur və bu tarixi araşdırmaq üçün yetərlidir. Nineviyadan 25 min, Arraphadan 4 min, Tel Şəmşaradan 150, Aşşurdan 700, Nippurdan 720, Babil, Borsippa, Sippar kimi arxeoloji məkanlardan 10 min, Maridən 20 min sənəd aşkar edilib. Bu əsərlər, sənədlər Qərb tərəfindən zəbt olunub və müxtəlif muzeylərdə yerləşdirilib. Bu sənədlərin çox az qismini əsasən rəvayət və əfsanələri

açıqlayıblar. Ehtimallara görə, XVIII-XIX-XX əsrlərdə xristian Avropanın sürətli inkişafına Şumer sivilizasiyasının Şərqdən gizlədilən hissəsi təkan verib və bu gün də Avropa bu sivilizasiya qaynaqlarından yararlanmaqdadır.” [22,62]

Müasir dilimizdə şumerlərlə bağlı anlam və etnosları yaşadan onomastik vahidlər yüzlərlədir. Bu onomastik vahidlər sırasında dünyanın ünvan dili, danışan sözləri sayılan toponimlər bələdçi eksponatlardır. Bunlardan bir neçəsinə nəzər salaq; Türkoloji ədəbi-nəzəri ədəbiyyatlarda patsinak (paçinak), baçnak, peçenek, beçene formalarında adına rast gəldiyimiz türk tayfası olan peçeneqlərin bir hissəsi kəngər adlanırlar. Ağdam və Bərdə rayonlarında olan Kəngərli kəndləri Kəngər tayfalarının adını müasir dilimizdə yaşadan toponimdir. Kəngər adına daha qədim dövrlərdə, yəni eramızdan 6 min il əvvəl şumer əsrində rast gəlirik. “Ölkənin Şumer hissəsinin adı ki.en.qi. şəklində yazıldığından bəlli olur ki şumerlər özlərini kenger adlandırmışlar”. Həmçinin “Fərat və Dəclə çaylarının vadilərində yaşayan xalqlar 5-6 min il bundan əvvəl “Qarabaşlılar” (Şumercə saq-giqa) adlanırdı” [5,83.]

Rus mənbələrində peçeneqlərin bir hissəsi, yəni kəngərlər “Qarabörklü” adlanırdı. Müqayisə etdikdə görürük ki, şumerlər özlərini kenger (qarabaşlı) adlandırır, XI-XII əsrlərdə peçeneqlərin bir qolu kəngər (Qarabörklü) adlanır. “Kitabi Dədə Qorqud” dastanında Qazan xanın :-Qara başım qurban sənə - deməsindən anlaşılır ki, onun nəsli “Qarabaşlı” adlanırmış. (Qara burada uca mənasındadır)

Buradan belə bir nəticəyə gəlirik ki, peçeneqlər Qafqaz Albaniyasının, Türk Oğuz yurdunun qədim yerli sakinləridir və əcdadları isə şumer türk tayfaları olmuşlar.Şumer türk tayfalarından biri də kiş tayfasıdır. Kiş etnosunu yaşadan kiş toponimləri Azərbaycan türk məkanında bu gün də qalmaqdadır. **“Kiş” nə deməkdir?!**

Xalq arasında bəd bir xəstəlikdən, şikəstlikdən danışılarkən hamı qulaqlarını dartıb kiş-kiş deyə əllərini yelləyirlər. Sanki bununla şər qüvvələri qovmuş olurlar. Demək, kiş nəyisə qovmaq məqamında söylənilir. Vaxtilə insanlar şər qüvvələri dəf etməkdə aciz olmuşlar. Odur ki, mənim zənnimcə, güclü sayılan və şər qüvvələrə qarşı mübarizədə qalib gələnlərə kiş-i demişlər. Kişi adam güclü ərən, igid kimi nəzərdə tutulmuşdur.

Müasir dövrümüzdə Şəki rayonunda Kiş kəndi, Kiş çayı vardır.Kiş kəndi elə bir qorxulu yerdə salınmışdır ki, dağlardan axan güclü sel kəndi yuyub apara bilər. Kiş çayı dəfələrlə tüğyan etmiş, qarşısına nə keçmişsə yuyub aparmışdır. Xalq bu adı ona görə vermişdir ki, şər qüvvəni qova bilsin, kiş deməklə şər qüvvələri yox etmiş olsun.

Laçın rayonunda Kiş dağı vardır. Xalq arasında bu dağa Keş dağı deyirdilər. Keş dağı müqəddəs dağ sayılırdı, burada qədim dövrlərdə zəyərəkdən yağ çıxarırmışlar. (Zərb

zəyərəkdən yağ çıxarar deyimi bu gün də işlənir) Dünya görmüş nənə və babalardan öyrənmişdim ki, bu dağa ona görə Kiş və yaxud Keş adı veriblər ki, bu dağ dərd azaldır, şər qüvvələri qovur. Odur ki, kimin ağır dərdi olanda, dərdini bu dağa söyləyərmiş və kiş-kiş deyib, dağdan imdad diləyərmiş. Ona görə də bu dağa Kiş dağı deyiblər ki, şər qüvvələri qovsun, dərdləri yox etsin.

Bağır adlı bir kişinin oğlu ölür. Bağır kişi dərdlərini unutmaq üçün bu dağa çıxıb lola (lola bayatı mənasında işlənən sözdür, ola bilsin ki, qədim dövrlərdə ağı və yaxud bayatıya “lola” deyirmişlər.) söylərmiş, odur ki, Bağır kişiyə xalq arasında Lola Bağır deyərmişlər. Bu gün həmin kişinin kəndi Lolabağırlı adlanır. Bağır şəxs adı Alban dövrünə aiddir. Kiş sözü isə daha qədim dövrə Şumər//Şumer dövrünə aid anlama malik sözdür. [16,66.]

Laçın rayonunda Qarakeşiş, Zorkeşiş adlanan kəndlər var idi. Qarakeşiş, Zorkeşiş adlandırılan bu kəndlər əslində Qarakeş, Zorkeş kəndləridir. Bu kəndlərdə də kişlilər məskunlaşdığı üçün kəndlər Qarakiş, Zorkiş kəndləri adlanmışdır. Tələffüzdə isə Qarakeş, Zorkeş kimi özünə ünvan qazanmışdır. Hal-hazırda bu kəndlərin adını dəyişib rəsmi sənədlərdə Qarakeçdi və Hacıxanlı yazırlar, lakin bu kəndlərin adı Qarakiş, Zorkiş və yaxud Qarakeş, Zorkeş olmalıdır.Bu toponimlər kis, kiş və yaxud keş adları ilə bəlli olan etnosun adı ilə bağlıdır.

Yuxarıda verilmiş şərhlər xalq etimalogiyası əsasında söylənilmişdir. Xalq deyimi, duyumu və anlamına dirsəklənib fikir söyləməklə yanaşı, elmi araşdırma, müqayisəli elmi nəticələr əldə etməkdə elmə əsaslanmaq ən optimal variantdır. Bu isə etimaloyi araşdırmanın başlıca amili kimi bizi real həqiqətə qovuşdurur. Elmi ədəbiyyatlardan oyrənirik: “Şumerlər İkiçayarasının sakinləri idi. Onlar burada e.ə. ıv minillikdə məskunlaşmışdılar. Son vaxtlar Şumer dilində bir çox türk mənşəli sözlərin olduğu aşkarlanıb. Şumerdə mövcud olmuş dövlətlər sülalərin adı ilə tanınırdı. Bunlardan birincisi Kiş sülalə dövlətidir. Kişdən sonra Uruq şəhər dövlətinin yüksəlişi başlanmışdır.” [5,5.]

Burada diqqəti cəlb edən Kiş sülaləsidir. Bu sülalənin adı Laçın rayonunda Kiş dağının, Şəkidə Kiş kəndinin və Kiş çayının adlarında özünü qoruyub saxlamışdır. Kiş adı altı min illik tarixi yaddaşı təsdiq edən sənəd kimi tarixin möhür eksponatına çevrilmişdir. Odur ki, biz Azərbaycan ərazisində əcdadlarımızın e.ə. ıv minillikdə bu ərazilərin sahibi olmasının şahidi oluruq.

Kiş adlı qalaların, hətta vilayətin olması barədə məlumatlar vardır. Tədqiqatçı alim filologiya elmləri doktoru İlhami Cəfərsoyun araşdırmalarındakı məlumatlardan bir

neçəsinə diqqət yetirək: "Orta Asiyadan Anadoluyadək neçə Kiş qalası var. Onlar tarixi qaynaqlarda Keş, Qiş, Kiş adıyla göstərilib.

Orta əsrlərdə Səmərqənd yaxınlığında Kiş adlı qala vardı.(Əbdürrəşid əl-Bakuvi, 1992,s. 129)

Kiş adlı ikinci qala isə yurdumuzda idi. "Gülüstani-İrəmdə verilən bilgiyə görə Kiş Şəki xanlığında həm qala, həm də çayın adı olmuşdur. "Əhsənüt-təvarix"də Kiş Şəkidə bir qala kimi göstərilmişdir. "Şəki tarixi"nin müəllifləri isə həm Kiş adlı qalanın, həm də kəndin olduğunu göstərirlər.

Kiş qalası haqqında ilk bilgilərdən biri "Alban tarixi"ndədir. Kitabda iki yerdə onun adı çəkilir. O yerdə ki, kilsə tikilməsindən söhbət gedir, o, tədqiqatçıların diqqəini daha çox cəlb etmişdir. Məlumdur ki, xristianların kiçik icmalarından biri Uti vilayətində Qiş kəndinin yaxınlığındakı bataqlıq yerdə yaşayırdı (Alban tarixi, 1993, s. 31, 32). Qafqazda ilk kilsə həmin yerdə tikilmişdi.

Başqa bir yerdə göstərilir ki, Ağvan ölkəsi 15 vilayətə bölünür. Onlardan biri eyni adlı şəhərdə Qisdir (История Агван, 1861, с. 362). Bu bilgi bizim üçün qiymətlidir. Ona görə ki, orada Kişin etnotoponim olduğu aydın görünür. Əgər eranın IV əsrində Kiş vilayət və vilayətin baş şəhəri imişsə, deməli, o, daxili müstəqilliyini qoruyub saxlayan etnos olub.

Kişlilər yalnız Qafqazda yox, Orta Asiyada, Altayda və Qərbi Sibirdə də yaşamış və mənbələrdə bir türk boyu kimi göstərilmişdir.

Səfəvilərin zamanında Kiş qalası mühüm müdafiə qalası idi. A.Bakıxanov yazır: Şah Təhmasib 1661-ci ildə Şəki vilayətinin Kiş qalasını tutdu.

XII əsr gürcü salnamələrində həm Kiş qalasının, həm də Kiş tayfasının adı çəkilir. Tiflis arxivlərində saxlanan XVIII yüzil farsdilli sənədlərdə kişlilərin türk olduğu və türk dilində danışdığı öz əksini tapmışdır (Путуридзе, 1965,12, 19 və 23 saylı sənədlər).

Buradan görünür ki, keşlilər Şəkinin yaxınlığında—Gürcüstanın şərq və Azərbaycanın qərb sınırları arasında yaşamışlar. XX əsrin ilk illərində Qaradağ mahalında üç Kiş kəndinin qeydə alınması (Дорожная карта. Петроград, 1917) göstərir ki, onlar yalnız Albaniyanın sakinləri deyillər. Kiş adının paralellərinə Şumer yazılarında təsadüf edirik." [27,126-128.]

Qədim Şumer dünyasından bu gün bizə bəlli olan ədəbi incilər Şumer-Azərbaycan türk ədəbi mühitini şərtləndirir. Ilkin mifik təsəvvürlər , ağılar atalar sözləri və zərb-məsəllər, müdrik kəlamlar, təmsil bədii yaradıcılıq növü, hekayə yaradıcılığı, dastan yaradıcılığı

Şumer-Azərbaycan türk mənəvi qohumluğunu sübut edir. Ona görə də bu nəticəyə gəlirik ki, əcdadlarımız sayılan etnoslardan biri də şumer dünyasından süzülüb gələn kiş etnosu kişlilərdir. Yaşadıqları əraziləri və tikdikləri qalaları öz adları ilə adlandırmaqla öz izlərini qoymuşlar və demək istəmişlər ki,

Bu qala bizim qala,

Tikdik ki, bizim qala,

Tikmədim özüm qalam.

Tikdim ki, izim qala.

"Türk dillərinin genologiyası: şumer və türk leksik paralelləri" kitabının müəllifi f.e.d. professor Nazim Hüseynli "Ön söz"də Şumer dili ilə türk dillərinin paralelliyini aşağıdakı prinsiplər əsasında şərh etmişdir:

"1. Tarixilik və məntiqilik.

2. Mədəniyyətlərarası paralellik.

3. Sivilizasiya və dilin paralelliyi.

4. Etnodünyagörüşlərin oxşarlığı və adların paralelliyi.

5. Dillərin leksikon ənənələri arasında genetik paralellik.[32,19.]

Müəllif yuxarıda göstərilən prinsiplər əsasında şumer dili ilə türk dillərinin paralelliyini geniş aspektdə şərh edərək belə bir nəticəyə gəlmişdir: "Təhlilimiz göstərir ki, hər bir etnosun yaratdığı adlar onun kamilliyini, hansı etnosla qohumluq əlaqələri olduğunu göstərən başlıca amillərdəndir. Adın izləri ilə hansı məkanda rastlaşırıqsa, deməli, orada həmin etnosun izi vardır. Məsələn, şumerlərdəki Kiş, Laqaş, Dilmun, Şərur, Susa adlarının Azərbaycan ərazilərində qarşılıqlarına misal olaraq Şəkidə Kiş kəndini, İsmayıllıda Lahıc, Ağsuda Dilman, Naxçıvanda Şərur, Qarabağda Şuşa adlarını göstərmək kifayətdir. Bununla yanaşı, onu da qeyd edək ki, şumerlərin öz adları Kienqeridir. Kəngərli formasında bu adla Azərbaycanın cənub hissəsində, Naxçıvan ərazisində və Türkmənistan bölgəsində nəsil, yer adları kimi rastlaşırıq.

Dediklərimizi ümumiləşdirərək belə bir nəticəyə gəlmiş oluruq ki, şumerlər və türklər arasında sivilizasiya, linqivistik ənənələr və etnodünyagörüşü parametrlərinə uyğun olaraq genetik qohumluq əlaqələri mövcuddur və onlar eyni soy-kökə malikdirlər."[10,32.]

Bu sitatda diqqəti cəlb edən anlamlardan biri də şumerlərin Azərbaycan türk məkanının bütün ərazilərində (Şəkidə, İsmayıllıda, Ağsuda, Naxçıvanda, Qarabağda) izlərinə və sözlərinə rast gəlməyimizdir.

“Bilqamıs” dastanında mif, adət-ənənə, deyim-duyum, inanc, alqış-qarğış, ümumiyyətlə, Azərbaycan türk millətinin həyatının bütün sahələrinə aid yanaşmaların şumerlərlə eyniyyət təşkil etməsi 6 min il bizim eradan əvvəl mövcud olmuş sirlərin üstünü açır və Azərbaycan türklərinin mənəvi dəyərlərinin ən qədim tarixə malik olduğunu təsdiqləyir. “Bilqamıs” dastanında Azərbaycan türk dünyası ilə müvazilik təşkil edən məqamlara diqqət yetirək:
“Bilqamıs” dastanında yazılmışdır:

“Müdrikliyə yetişmiş, dünyanı dərk eləmiş
Bir insan haqqındadır bizim bu dastanımız.
O hər sirri bilərdi, o hər şeyi görərdi
Yeri su basmasından bizə xəbər verərdi
Uzun yollar dolaşıb, yorulub əldən düşdü
Başına gələnləri sal bir qayaya döydü
Sonra hasara alıb, adını Uruk qoydu” [10,9.]

“Kitabi-Dədə Qorqud” dastanından oxuyuruq:
“O kişi oğuzların kamil bilicisi idi: nə deyirdisə, olurdu.
Gələcəkdən qəribə xəbərlər söyləyərdi. Allah onun könlünə ilham verirdi”[28,172.]

Hər iki dastandan verilmiş nümunədən aydın olur ki, müdrikliyə yetişmiş, kamil bilici insan, dürlu xəbərlər söyləyən, hər sirri bilən hər şeyə ad verən Bilqamıs və Dədə-Qorqud ədəbi qəhrəmanları biri-birini tamamlayan və müxtəlif zamanlarda eyni etnosların təfəkkür süzgəcindən süzülüb tarixə qovuşan, mənəvi dünyamızın daşıyıcılarıdır. Belə misallar yüzlərcədir. Belə bir nəticəyə gəlirik ki, Şumer Azərbaycan paralelliyində ərazi yaxınlığı, dil müştərikliyi, mif, adət-ənənə eyniliyi, folklorumuzda mövzu, deyim-duyum, inanc, alqış-qarğış ümumiyyətlə, xalqımızın həyatının bütün sahələrinə aid yanaşmaların müvaziliyi dünyaya bəyan edir: Şumer Azərbaycan etnik birliyi və eyniliyi Azərbaycan türk millətinin qədimliyini, yüksək mədəniyyət sahibi olduğunu qeyri-şərtsiz təsdiqləyir və şumer türk etnoslarının Azərbaycan-türk məkanının sahibləri olduğunu bəyan edir.

## Şumer Alban Azərbaycan türk paralelliyi.

Azərbaycanın etnik tarixi onun etnogenezi ilə bağlı e.ə. VIII əsrdən etibarən qədim türk, şumer, alban xətti ilə sıralanaraq müasir duruma gəlib çatmışdır. Bu konsepsiya artıq ədəbi-nəzəri fikirdə öz təsdiqini tapmışdır. Ona görə də şair, ədəbiyyatşünas, publisist Gülxani Pənahın (Şükürova Gülxani Vaqif qızı) aşağıdakı fikirlərini fəxarət hissi ilə qeyd etməyi özümə borc bilirəm. Gülxani Pənah demişdir: "Mən şumer köklü, İskit soylu, Sak ləyaqətli, Hun əzəmətli, Oğuz nəsilli, Türk əsilli türkəm."

Şumer, Alban, Azərbycan Türk mədəniyyəti eyni bir xalqın mədəniyyətidir və ümumən əski türk başlanğıcından qaynaqlanmışdır. "Dünya elmi fikrinin görkəmli nümayəndələrinin gəldiyi nəticələr əsasən bir nöqtədə birləşir: Tarix şumerdən başlanır, şumerlər müasir türk xalqlarının soy-kökündür; şumerlərin dili prototürk dilidir." (2,5.) Bura onu da əlavə etmək lazımdır ki, Alban etnosu Azərbaycan türklərinin əcdadlarıdırlar və Alban dili də prototürk dilidir. Demək, Şumer, Alban Azərbaycan türk xalqı eyni kökə-soya malikdir. "Şumer Azərbaycan etnik birliyi və eyniliyi " bölümündə şumerlərin Azərbyacan türkünün etnik soyu olduğunun dəlillər əsasında şahidi olduq. Burada isə albanların da şumer kökünə bağlılığı və azərbaycan türkünün əcdadı olması faktlarının şərhinə çalışacayıq. Odur ki, Şumer, Alban, Azərbaycan türk paralelliyinə əsasən eyni sözün, eyni məna anlamının uzun əsrlərin sınağında bir səs dəyişməsi belə olmadan bu günümüzə qədər gəlib çatması bir daha bunların eyni kökə, eyni soya bağlılığını təsdiq edir:

| Şumer dilində — | Albanca — | Azərbaycanca. |
|---|---|---|
| Ac — | ac — | ac (ac adam) |
| Aç — | aç — | aç(maq) |
| Açıq — | açıx — | açıq (açıq qapı) |
| Adam — | adam — | adam |
| Ağ — | ağ — | ağ |
| Ağaç — | ağaç — | ağac |
| Ağır — | ağır — | ağır |

| | | |
|---|---|---|
| Alaçıq — | alaçıx — | alaçıq (çadır evi) |
| Alma — | alma — | alma |
| Alp — | alp — | alp (igid) |
| Altı — | altı — | altı (say) |
| Ana — | ana — | ana |
| Ardıc — | ardux — | ardıc (bitki) |
| Arpa — | arpa — | arpa (dənli bitki) |
| As(maq) — | as(maq) — | as (maq) |
| Aş — | aş — | aş (plov) |
| At(maq) — | at(maq) — | at(maq) |
| Ata — | ata — | ata |
| Ay — | ay — | ay (təqvimi ay) |
| Ayaq — | ayax — | ayaq (bədən üzvü) |
| Ayğır — | ayqır — | ayğır (erkək at) |
| Ayran — | ayran — | ayran |
| Az — | az — | az (çox olmayan) |
| Azmaq — | azmaq — | azmaq |
| Aldatmax — | aldatmax — | aldatmaq |
| Alt — | alt — | alt |
| Altımış — | altımış — | altmış |
| Altınçı — | altınçı — | altıncı |
| Arx — | arx — | arx (kanal) |
| Baba — | baba — | baba |
| Baca — | baca — | baca |

| | | |
|---|---|---|
| Bağır — | Bağır — | Bağır (şəxs adı) |
| Bağır — | bağır — | bağır (qaraciyər) |
| Bal — | bal — | bal |
| Bala — | bala — | bala |
| Balıq — | balıx — | balıq |
| Balta — | balta — | balta |
| Bardaq — | bardax — | bardaq (su qabı) |
| Barmaq — | barmax — | barmaq |
| Baş — | baş — | baş |
| Beşik — | beşik — | beşik |
| Bir — | bir — | bir (say) |
| Bit — | bit — | bit (bit, birə) |
| Boğaz — | boğaz — | boğaz (hamilə) |
| Boş — | boş — | boş (boş qab) |
| Boyun — | boyun — | boyun |
| Böyrək — | börək — | böyrək |
| Buz — | buz — | buz |
| Balaban — | balaban — | balaban |
| Batman — | batman — | batman |
| Bayram — | bayram — | bayram |
| Beş — | beş — | beş (say) |
| Beşinci — | beşinci — | beşinci |
| Bilik — | bilik — | bilik |
| Bostan — | bostan — | bostan |

| | | |
|---|---|---|
| Bulaq — | bulax — | bulaq |
| Çiçək — | çiçəg — | çiçək |
| Çörək — | çörək — | çörək |
| Dağ — | dağ (tağ, tav) — | dağ |
| Dəli — | dəli — | dəli |
| Dodaq — | dudağ — | dodaq |
| El — | el — | el |
| əl — | əl — | əl |
| əlik — | əlik — | əlik (cüyürün bir növü) |
| ənik — | ənik — | ənik (yırtıcı balası) |
| ər — | ər — | ər (kişi) |
| it — | it — | it |
| kişi — | kişi — | kişi |
| kömür — | kömür — | kömür |
| qar — | qar — | qar |
| qutan — | qutan — | qutan (vağ quşu) |
| oğul — | oğul — | oğul |
| ox — | ox — | ox |
| ot — | ot — | ot |
| öd — | öd — | öd |
| öfgə — | opgə — | öfgə (ağ ciyər) |
| ördək — | ördək — | ördək |
| ön — | ön — | ön (qarşı) |
| saç — | saç — | saç |

| | | |
|---|---|---|
| sarı — | sarı — | sarı |
| təpə — | təbə — | təpə |
| üst — | üst — | üst |
| yel — | yel — | yel |
| yox — | yox — | yox |
| cadu — | cadu — | cadu (ovsun) |
| çanaq — | çanax — | çanaq |
| çarıq — | carux — | çarıq |
| çıraq — | çerax — | çıraq |
| çoban — | çoban — | çoban |
| çoçun — | çoçun — | çoçun (çoçununa gəlir) |
| çox — | çor — | çor (xəstəlik) |
| çul — | çul — | çul |
| dad — | dad — | dad (ləzzət) |
| dəf — | dəf — | dəf (musiqi aləti) |
| dəyirman — | dəgirmən — | dəyirman |
| dörd — | dört — | dörd (say) |
| döşək — | döşəg — | döşək |
| iki — | eki — | iki |
| elçi — | elçi — | elçi |
| əyri — | əgri — | əyri |
| ələk — | ələk — | ələk |
| əlli — | əlli — | əlli |
| ət — | ət — | ət |

| | | |
|---|---|---|
| günah — | günah — | günah |
| günəş — | günəş — | günəş |
| kərki — | kərki — | kərki |
| körpü — | körpü — | körpü |
| min — | min — | min |
| ordu — | ordu — | ordu |
| otuz — | otuz — | otuz |
| palan — | palan — | palan |
| daş — | taş — | daş |
| Tenqri — | Tanqrı — | Tanrı |
| Dolma — | tolma — | dolma |

Nə Şumer dilində, nə də Alban dilində j, r hərfləri ilə başlayan söz yoxdur. Müasir dilimizdə də belə sözlər alınma sözlərdir. Alban yəni qarqar — qıpçaq dilinin fonetik və leksik xüsusiyyətləri barədə “Qafqaz Albanlarının dili və ədəbiyyatı” kitabında Bəxtiyar Tuncay Albandilli əlyazmalara istinad edərək Alban dilinin spesifik xüsusiyyətlərini aşağıdakı kimi səciyyələndirmişdir: “Sait sistemi eynən Azərbaycan türkcəsində olduğu kimi 9 səsdən ibarətdir və bizimki ilə tam eynidir. Onlardan 4-ü qalın (a, ı, o, u), 5-i isə incə (e, ə, i, ö, ü).

Azərbaycan türkcəsində samit səslərin sayı 24-dürsə, alban (qıpçaq-qarqar) türkcəsində bu rəqəm bizdə olmayan, fəqət Şamxor-Tovuz şivəsində hələ də işlənməkdə olan “nq” qarışıq səsi hesabına 25-dir. Buna alınma sözlərdə işlənən və rus dilindəki “ц” hərfinin ifadə etdiyi səslə eynilik təşkil edən səsi də əlavə etmək olar. Bu səslə birlikdə samitlərin ümumi sayı 26 edir.

Alban dilindəki samit səslər bunlardır:

B, c, ц, d, f, g, ğ, q, h, x, j, k, k`, l, m, n, nq, p, r, s, ş, t, v, y, z.

Məlumat üçün bildirək ki, bütün türk ləhcə və şivələrinə, o cümlədən Azərbaycan türkcəsinə xas olan ahəng qanunu Alban dilinə də xasdır.” (9,260.)

Alban dilində olan sadə və düzəltmə isimlər, ismin qrammatik kateqoriyaları, sifətin mənaca növləri, sifətin quruluşca növləri, sifətin dərəcələri, say və onun məna növləri, əvəzlik, zərf, fel və ona məxsus məna qrupları, sadə, düzəltmə, mürəkkəb fellər, felin qrammatik kateqoriyaları, qoşma, bağlayıcı və ədatlar da müasir Azərbaycan türkcəsi ilə müştərəklik təşkil edir. Alban dili də iltisaqi (aqlyunativ) dillər qrupuna daxildir.

## Nəticə

Müdriklər deyiblər ki, keçmiş gələcəyin bünövrəsi, gələcək isə keçmişin davamıdır. Keçmişinə sahib çıxmayanlar gələcəyin qurbanına çevrilirlər. Necə ki, biz soy kökümüz olan Alban (qarqar-qıpçaq) dili və ədəbiyyatına sahib çıxa bilmədiyimizə görə ermənilər Alban irsini nə varsa mənimsəyib, assimilyasiya edib, özününküləşdirmişlər. Ona görə də dərk etməliyik ki, dünənimiz bu gün üçün bünövrə, gələcək üçün zirvədir. Bünövrəni unutsaq, zirvəni fəth edə bilməyəcəyik. Dünəninə biganə baxanların gələcəyi yoxdur. Gələcək bu günə və keçmişə dirsəklənir. Odur ki, Azərbaycan türkünün də etnik tarixi e.ə. III və I minilliklərə dirsəklənir. Azərbaycanın qədim və erkən orta əsrlərə dair çoxminillik etnik tarixi onun etnogenezi ilə bağlı e.ə. VIII əsrdən etibarən qədim türk, şumer, alban xətti ilə sıralanaraq müasir duruma gəlib çatmışdır. “Azərbaycan xalqının tarixi ümumtürk tarixinin ən qədim və ən zəngin hissəsidir; çünki qədim türklərin ilk dövlət qurumları məhz Azərbaycan ərazisində yaranmışdır. Türk etnoslarının qədim dövrdə və erkən orta əsrlərdə Azərbaycan ərazisində Manna və Maday(e.ə. VIII-VI əsrlər), Sak çarlığı(e.ə. VII-V əsrlər), Atropatena(e.ə. IV--- eranın III əsrləri), Albaniya(e.ə. IV--- eranın VII əsrləri)..... və b. çoxlu dövlət qurumları vardır.”(18,239). Ona görə də şair, publisist Gülxani Pənah haqlı olaraq demişdir ki, mən Şumer köklü, İskit soylu, Sak ləyaqətli, Hun əzəmətli, Oğuz nəsilli, Türk əsilli türkəm.

Azərbaycanda qədim zamanlardan etibarən multikultural mühit formalaşmışdır. Bunun nəticəsidir ki, milli adət-ənənə, inanc, musiqi, yemək və əşyalarımız etnik deyil, ümumbəşəri formada qaynayıb qarışmışdır. Lakin bu multikultural münasibətlərə radikal mövqedən yanaşıb şər toxumu səpən erməni adlandırdığımız “dünya şöhrətli işbazlar” kölgə salsalar da, bu anlayışın beynəlxalq əhəmiyyətini azalda bilməyəcəklər. Çünki Azərbaycanda Zərdüştlük, Yəhudilik, Dağ yəhudiləri, Avropa yəhudiləri (aşkenazilər), Xristianlıq, Pravoslavlıq, Katoliklik, Protestantlıq və İslam dininin geniş yayılması ölkəmizin tolerantlıq mədəniyyətini və Azərbaycanın mədəniyyətlərin qovşağında yerləşməsi amilini şərtləndirir.

Azərbaycanın ulu keçmişi Qafqaz Albaniyasında qədim Alban məbədləri bütün xristian dünyasında ən qədim kilsələrdir və apostol mənşəlidir. Odur ki, Qafqaz Albaniyasının ərazisi ilk xristian icmalarının meydana gəldiyi məkandır. Bu məsələni Moisey Kalankatuklu “Alban tarixi” əsərində də qeyd etmişdir. Məlumat vermişdir ki, Albaniyada eramızın II yüzilliyindən başlayaraq ilk xristian icmaları yaranıb, IV yüzilliyin I rübündə (313-cü ildə) isə Alban çarı Urnayr Xristianlığı dövlət dini elan edib. İlk xristian apostol kilsəsi Qafqaz Albaniyasında təsis olunub. Hətta xristianlığın banisi İsa Məsihin

anadan olması münasibəti ilə Şərqdən (Ə.Ə. Albaniyadan) Qüdsə gəlib ona səcdə qılıb, hədiyyələr təqdim edən də ilk dəfə şərqlilər (albanlar) olmuşlar. Bu haqda "İncil"də belə yazılmışdır:

"1.İSA padşah Hirodun günlərində, Yəhudeya Beytlehemində anadan olan zaman, Şərqdən Yeruşalimə münəccimlər gəlib dedilər:

2."Anadan olan yəhudilərin Padşahı haradadır? Çünki, Onun ulduzunu Şərqdə

gördük və Ona səcdə qılmağa gəldik."........

11.Evə gəlib anası Məryəm ilə Körpəni gördülər və yerə qapanıb, Ona səcdə qıldılar. Xəzinələrini açaraq Ona hədiyyələr, qızıl, günnük və mirra təqdim etdilər."(23,13.)

Buradan bir daha aydın olur ki, təqdim olunan hədiyyələr dəyərli olmaqla yanaşı, Şərqin də rəmzini əks etdirir. Günnük gün ölkəsinin(Şərqin) simvoludur.

VII əsrin II yarısından etibarən Xristianlıq tədricən mövqeyini itirib, 705-ci ildə Alban dövləti süquta uğrayıbdı. Albaniyanın Aran (düzən) ərazilərində məskunlaşan əhali İslam dinini qəbul edərək müsəlmanlaşıb, Kiçik Qafqazın cənub-qərbində yaşayan albanlar monofizit erməni qriqoryan dininin təzyiqi altında erməniləşib, Kiçik Qafqazın şimal-şərq ərazisinin albanları isə diofizit gürcü-pravoslav kilsəsinin təzyiqi ilə gürcüləşibdi. Amma Udinlər isə Alban etnosunun bir tayfası kimi bu gün də Oğuz və Qəbələ rayonlarında öz etnik xüsusiyyətlərini qoruyaraq yaşayırlar.

Qədim və zəngin olan Azərbaycan elə bir unikal tarixi məkandır ki, burada yüzlərlə etnos pərvəriş tapmış və hər bir etnosun dünyaya baxış fəlsəfəsi formalaşmışdır. Bəşər övladı eyni həyat qazanında bişib, cilalanıb formalaşmışdır. Demək, bizim dövrümüz çoxəsrlik dünya qazanında bişmiş sinxronok bir aləmdir. Biz bu aləmdə şamanlıq, büdpərəstlik, ümumiyyətlə, hər bir şeyə tapınma, xristianlıq, islamçılıq və s. inancları görə bilərik. Tarixin inkişaf xətti və fəlsəfi duyumu imkan verir deyək ki, bəşər övladının beşiyi və məzarı, inam və inancları eyni nöqtədə birləşir və bu labüddür. Çünki bəşər övladının başlanğıcı və sonu eyni nöqtədə dərk olunur. Odur ki, tolerantlıq, multikulturalizm bəşər övladının ali dərketmə hissidir, dinc birgəyaşayış ənənəsinə sadiqlik, qarşılıqlı hörmət və ehtiram duyğularına dayanıqlılıq zirvəsidir. Buna görə də Azərbaycanda ayrı-ayrı etnosları xalq "din ayrı qardaş" adlandırır. Eyni atmosferin havasını udan, eyni torpaqdan, sudan qidalanan bəşər övladı (varlıqla yoxluq fəlsəfəsinə söykənən insan) ayrı-ayrı hissələrin tam varlığıdır. Buna görə də radikalizmə son qoyulmalıdır. Bütün dünyanı təhlükə altına alan dini radikalizm və terror bəlasının yüksək dərəcədə qorxulu və dəhşətli olduğunu nəzərə

alan Azərbaycan Prezidenti İlham Əliyev 2016-cı ili “Multikulturalizm ili” elan etməklə bəşəriyyətə həyəcan dolu mesaj göndərmişdir.

Azərbaycan türk millətinin dövlətçiliyi, dili və mədəniyyətinin tarixi vərəsəsi e. ə. IV-----eramızın VII əsrinə qədər mövcud olmuş Albaniya dövləti, Alban (qarqar-qıpçaq) dili və Alban mədəniyyəti olmuşdur. Odur ki, “Azərbaycan türk dilinin birbaşa sələfi Atropatena və Alban ümumxalq danışıq dilidir. Mannada və Midiyada tayfa ittifaqları xalqa çevrilmədiyinə görə ümumxalq danışıq dili də yarana bilməzdi. Ona görə təxminən eyni tarixi mərhələ çərçivəsində yaranmış bu dillər Azərbaycan dilinin bünövrəsini təşkil edir. Alban tarixçisi Musa Kalankatuklunun çar vaçaqanın (V əsr) bütün əyalətlərə fərmanlar göndərməsi haqqında məlumatından (I kitab 20-ci fəsil) aydın olur ki, Albaniyada ümumxalq danışıq dili vardı. Alban dili həm də V-VII əsrlərdə yazılı dil idi. Mənbələrdə qeyd olunur ki, “Bibliya” Alban dilinə tərcümə olunmuşdur. Bu onu göstərir ki, Alban dili “Bibliya” kimi kitabın dilini verməyə qadir lüğət fonduna malik dil idi. Bilirik ki, ərəblərin Azərbaycanı işğal etməsilə Alban etnosu dini mənsubiyyətcə parçalanmış, VIII əsrin əvvəlində xilafətin köməyi ilə erməni kilsəsi Alban kilsəsini özünə tabe etmişdi. Bu Alban yazısının məhvinə səbəb olduğu kimi, Alban danışıq dilinə də zərbə vurmuşdu. Əslində ümumxalq Alban danışıq və yazılı dilinin tarixi bununla bitir və VIII əsrdən sonra Albaniya və Atropatenada türk tayfalarının Albanların müsəlman hissəsi və atropatenlilərlə konsolidasiyası yeni etnosun------Azərbaycan etnosunun formalaşmasına səbəb olmuşdur. Böyük Nizami və Xaqani məhz Albaniya ərazisində əsrlər boyu formalaşmış mədəni irsi və formalaşmış dili əhatə edən özül üzərində yüksəlmişdi Nizami etnik mənsubiyyətcə türk idi və onun ana dili də albanların türk dili idi. Əlumdur ki, Nizami qıpçaq qızı ilə evlənmişdi. Yəqin ki, həmin qız nə ərəb, nə də farsca bilmirdi. Nizami türk deyildisə (XI-XII əsrrlərə qədər Alban əhalisinin Qafqazmənşəli olmasını söyləyən tarixçilərimizin ardınca getsək) türk qızı ilə necə ailə qura bilərdi?! Belə aydın məsələləri də bəzi tədqiqatçı tarixçilərimizə başa salmaq olmur....

Oğuzların dili yazılı dil idi. Hələ orta Asiyada onların dilində əsərlər yaranmışdı. “Kitabi-Dədə Qorqud”un dili həmin oğuzların dili ilə yerli alban-atropaten dillərinin konsolidasiyası prosesinin nəticəsində təşəkkül tapmış dil idi. Lakin Qətran Təbrizinin, Nizaminin, Xaqaninin və ümumiyyətlə, XIII əsrə qədər yazıb yaratmış Azərbaycan şairlərinin dili oğuzların gəlişinə qədərki ümumxalq danışıq dili idi.” (18, 234-235). Bir daha aydın olur ki, Alban dili və mədəniyyəti birmənalı şəkildə Azərbaycan türkünün vərəsəsi, bünövrəsi və köküdür.

# Ədəbiyyat

1.Azərbaycan tarixi üzrə qaynaqlar, Bakı, 1989.

2.Azərbaycan toponimlərinin ensklopedik lüğəti, 2 cilddə, Bakı, 2007.

3.Aydın Qarabağlı. Qarabağ, onun qədim tayfaları və toponimləri, Bakı, 2008.

4.Aydın Qarabağlı. Azərbaycanın Qarqar Uruqları və Amazonkalar, Bakı, 2015.

5.Ayna uşaq ensiklopediyası, "Tarix keçmişdən gələcəyə", Bakı, 2004.

6."AME" Elmi Mərkəzi, Bakı, 2007.

7.A.A. Axundov. Torpağın köksündə tarixin izləri, Bakı, 1983.

8.Azərbaycan SSR, İnzibati ərazi bölgüsü, Bakı, 1968.

9.Bəxtiyar Tuncay. Qafqaz Albanlarının dili və ədəbiyyatı, Bakı, 2010.

10.Bilqamıs dastanı, Bakı, 1999.

11.Cəlil Nağıyev. Qədim Şərq ədəbiyyatı tarixi, Bakı, 2004.

12.Elməddin Əlibəyzadə. Azərbaycan ədəbiyyatı tarixi(ən qədim dövrlər), Bakı, 2009.

13.Elşad Abışov. El-oba adlarının izi ilə, Bakı, 2007.

14.Əjdər Fərzəli Qorqud. Dədə Qorqud sözü, Bakı, 1999.

15.Əjdər Fərzəli. Dədə Qorqud yurdu, Bakı, 1989.

16.Əli Əliyev. Laçın----Qədim Oğuz yurdu, Bakı, 2009.

17.Gündüz İsmayılov. Tolerantlıq, Bakı, 2014.

18.Qiyasəddin Qeybullayev. Azərbaycan türklərinin təşəkkülü tarixindən, Bakı, 1994.

19.Qiyasəddin Qeybullayev. Qədim Türklər və Ermənistan, Bakı, 1992.

20.Qədim Şərq ədəbiyyatı müntəxabatı, Bakı, 2007.

21.Heydər Əliyevin aforizmləri. Deyilən söz yadigardır, Azərbaycan Yazıçılar Klubu, 2013.

22.Xaqani Ədəboğlu. Unudulmuş Turanın çöl çiçəkləri. Bakı, 2006.

23.İncil, Bibliya Tərcümə İnstitutu, 1993.

24.İlhami Cəfərsoy. Türk dillərində teonim və etnonimlər, Bakı, 2010.

25.İlhami Cəfərsoy. İber və H!ay folklorunda türk mifik təfəkkürünün izləri, Bakı, 2014.

26.Lhami Cəfərsoy. Türklər rusların soy kökündə, Bakı, 1995.

27.İlhami Cəfərsoy. Sibirdə Təbriz şəhəri, Bakı, 2005.

28.Kitabi-Dədə Qorqud, Bakı, 2004.

29.Moisey Kalankatuklu. Albaniya tarixi, Bakı, 1993.

30.Məmmədhənifə Musayev, Malik Mirzəyev. Türk dünyası, Bakı, 2004.

31.Mirəli Seyidov. Azərbaycan xalqının soykökünü düşünərkən, Bakı, 1989.

32.Nazim Hüseynli, Lalə Məmmədova. Türk dillərinin genologiyası: Şumer

və türk leksik paralelləri, Bakı, 2012.

33.Nazim Tapdıqoğlu. Laçın rayonu və onun toponomiyası, Bakı. 2005.

34.Nazim Tapdıqoölu. Aöcabədi Ensiklopediyası, Bakı, 2007.

35.Nazim Tapdıqoğlu. Şəmkir rayonu və onun toponimiyası, Bakı, 2005.

36.Nizami Gəncəvi. Lirika, Bakı, 2004.

37.Nizami Gəncəvi. Xosrov və Şirin, Bakı, 2004.

38.Nizami Gəncəvi. İsgəndərnamə (Şərəfnamə), Bakı, 2004.

39.N.G. Məmmədov. Toponimika, Bakı, 2007.

40.Vaqif Piriyev. Azərbaycanın tarixi-siyasi coörafiyası, Bakı, 2006.

41.Ziya Bünyadov. Azərbaycan VII-IX əsrlərdə, Bakı, 1989.

42.Pərviz İsmyılov. Kəlbəcər rayonunun yer-yurd adları, Bakı, 2012.

43.Gəncə-Qarabağ əyalətinin müfəssəl dəftəri, Bakı, 2000.

